## TİBB VƏ ƏCZAÇILIQ ELMLƏRİ

## MEDICAL AND PHARMACEUTICAL SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/39/7-11

**İbadulla Ağayev**
Azərbaycan Tibb Universiteti
tibb elmləri doktoru
amuepid@mail.ru
**Xatirə Xələfli**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
khalafli@mail.ru
**Məhərrəm Niftullayev**
Azərbaycan Tibb Universiteti
tibb elmləri doktoru
mniftullayev@gmail.com
**Leyla Əhmədzadə**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
leyla.akhmedzade@mail.ru
**Dəstə Qasımova**
Azərbaycan Tibb Universiteti
qasimovadasta@gmail.com

# XƏSTƏXANADAXİLİ İNFEKSİYALARIN QARŞISININ ALINMASI YOLLARI VƏ MÜBARİZƏ TƏDBİRLƏRİ

**Xülasə**

Məqalədə xəstəxanadaxili infeksiyaların qarşısının alınması yolları və mübarizə tədbirlərinə dair qısa məlumatlar verilmiş, son illər bu xəstəliklərin öyrənilməsi üzrə əldə edilən uğurlar və təcrübədə risk amillərin aşkar edilməsi paylaşılmışdır.

Xəstəxanadaxili infeksiyalar əsas xəstəliyin gedişini ağırlaşdırır, bəzən xəstənin həyatını təhlükə qarşısında qoyur, xəstələrin stasionarda qalma müddətini uzadır. İrinli-septiki xəstəliklərin ağır formaları ilə xəstələrin stasionarlarda uzun müddət müalicə alması ilə əlaqədar olaraq əmələ gələn bakteriyaların hospital ştamlarının olduqca yüksək patogenliyi yüksək letallığın yaranmasını şərtləndirir.

Hospital infeksiyaların törədicilərinin yoluxma mexanizmi və yolları stasionarın profilindən, xəstələrin kontingentindən, müalicə-diaqnostik prosedurların və manipulyasiyaların həcmindən asılıdır. Xəstəxanadaxili infeksiyaların diaqnostikası törədicilərin mikrobioloji metodlarla, o cümlədən molekulyar-genetik metodların vasitəsilə aşkarlanmasına əsaslanmışdır. Törədicilərin tipləşdirilməsi alovlanmanı səciyyələndirməyə, yəni infeksiya mənbəyini, yoluxma mexanizmini və onların rezervuarını təyin etməyə imkan verir.

***Açar sözlər:*** *epidemiologiya, profilaktika, qeyri-yoluxucu xəstəliklər, diaqnostika, risk amilləri, epidemioloji aspektlər*

**Ibadulla Aghayev**
Azerbaijan Medical University
Doctor of medical sciences
amuepid@mail.ru

**Khatira Khalafli**
Azerbaijan Medical University
Doctor of philosophy in medicine
khalafli@mail.ru
**Maharram Niftullayev**
Azerbaijan Medical University
Doctor of medical sciences
mniftullayev@gmail.com
**Leyla Akhmadzade**
Azerbaijan Medical University
Doctor of philosophy in medicine
leyla.akhmedzade@mail.ru
**Dasta Gasimova**
Azerbaijan Medical University
qasimovadasta@gmail.com

# Ways of prevention and control measures of nosocomial infections

## Abstract

In the article, brief information on ways to prevent hospital-acquired infections and countermeasures was given, the successes achieved in the study of these diseases in recent years and the discovery of risk factors in practice were shared.

Nosocomial infections aggravate the course of the main disease, sometimes put the patient's life at risk, and prolong the length of stay of patients in the hospital. Extremely high pathogenicity of hospital strains of bacteria formed in connection with long-term treatment of patients with severe forms of purulent-septic diseases causes high lethality.

The mechanism and ways of infection of the causative agents of hospital infections depend on the profile of the inpatient, the contingent of patients, the volume of treatment-diagnostic procedures and manipulations. Diagnosis of nosocomial infections is based on detection of causative agents by microbiological methods, including molecular genetic methods. Typing of pathogens allows to characterize the outbreak, that is, to determine the source of infection, the mechanism of infection and their reservoir.

***Keywords:*** *epidemiology, prevention, non-infectious diseases, diagnostics, risk factors, epidemiological aspects*

## Giriş

Xəstəxanadaxili infeksiya həm stasionarın xəstələri, poliklinikaya gedənlər arasında, həm də tibb heyəti arasında inkişaf edir. Yoluxma xəstələrlə təmas zamanı, müalicə-profilatika müəssisələrində əksepidemik rejim pozulduqda, zərərsizləş-dirilməmiş alətlərdən istifadə etdikdə, peşə fəaliyyəti nəticəsində (cərrahların B və C viruslu hepatitləri yoluxması), laboratoriyalarda qəzalar zamanı baş verir. Stasionarlarda xəstəxanadaxili infeksiyalar əsasən Fleksner və Zonne şigelyozları, A, B və C viruslu hepatitləri, sidik-cinsiyyət yollarının, aşağı tənəffüs yollarının irinli-septiki xəstəlikləri, qan dövranının infeksiyaları ilə təmsil edilir (Ağayev, 2022: 146).

Uşaq stasionarlarında xəstəxanadaxili infeksiyalar kimi eşerixiozlar (O55, O75, O144 daha çox yayılmışdır) rast gəlir. Cərrahi uşaq stasionarlarında xəstəxanadaxili infeksiyalar arasında sepsis, pnevmoniya, mədə-bağırsaq yolunun infeksiyaları, omfalit (göbək nahiyəsində dəri və dərialtı toxumanın iltihabı), konyunktivit, dərinin infeksiyaları, sidik- cinsiyyət yolarının infeksiyaları daha çox rast gəlir (Ağayev, 2022: 56). Xəstəxanadaxili infeksiyaların inkişaf etməsinə aşağıdakılar səbəb olur: a) yüksək virulent xüsusiyyətlərinə və dərman davamlılığına malik stafilokokların və müxtəlif qram-mənfi bakteriyaların hospital ştamlarının formalaşması; b) tibb heyəti arasında törədicigəzdirənlik (patogen stafilokokların daimi gəzdirənlərinin payı tibb heyətinin 40%-ni təşkil

edir); c) zərərsizləşdirilməmiş xəstələrin qulluq əşyaları və alətlərindən istifadə olunması, xəstəxana müəssisələrində sanitar-gigiyenik rejimin, şəxsi gigiyena qaydalarının pozulması. Xəstəxanadaxili infeksiyaların inkişaf etməsinə stasionar müalicəsində olan xəstələrdə infeksiyalara qarşı rezistentliyin zəifləməsi də şərait yaradır (Boev, 2017: 51).

Xəstəxanadaxili infeksiyalar əsas xəstəliyin gedişini ağırlaşdırır, bəzən xəstənin həyatını təhlükə qarşısında qoyur, xəstələrin stasionarda qalma müddətini uzadır. İrinli-septiki xəstəliklərin ağır formaları ilə xəstələrin stasionarlarda uzun müddət müalicə alması ilə əlaqədar olaraq əmələ gələn bakteriyaların hospital ştamlarının olduqca yüksək patogenliyi yüksək letallığın yaranmasını şərtləndirir. Əməliyyatdan sonrakı letallığın 40%-i xəstəxanadaxili irinli-septiki infeksiyalarla törədilir (Cilloniz, 2019: 656). Onların törədiciləri – stafilokoklar, streptokoklar, qram-mənfi bakteriyalar, klostridiyalar və s.

Hospital infeksiyalar sporadik hallar və alovlanmalar şəklində qeydə alınır, onların sayı bəzi regionlarda artma meylinə malikdir (Stiller, 2017:71). Orta hesabla stasionara hospitallaşdırılmış xəstələrin 3-5%-də nozokominal infeksiya inkişaf edir. Etioloji baxımdan hospital infeksiya təqribən 90%-də bakterial mənşəlidir, az hallarda viruslar, göbələklər və ibtidailər tərəfindən törədilir (Bell, 2017: 551).

Ətraf mühitdə şərti-patogen mikroorqanizmlərin geniş yayılması ilə əlaqədar olaraq, onlar çox vaxt xəstəxanadaxili infeksiyaların inkişafının səbəbinə çevrilirlər ki, buna əsas xəstəliklə əlaqədar stasionara hospitallaşdırılmış xəstədə immunsupressiyanın inkişaf etməsi şərait yaradır (Flores-Mireles, 2019:228).

Bir çox ölkələrdə müşahidə olunan hospital infeksiya ilə xəstələnmənin yüksəlməsi cərrahi və invaziv müalicə-diaqnostik prosedurlarının, o cümlədən cərrahi manipulyasiyaların, biopsiyaların, punksiyaların və s. tezliyinin, həmçinin immunsupressiyalı şəxslərin xüsusi çəkisinin artması ilə bağlıdır. Sonuncu həm ekoloji gərginlik, həm də dərman vasitələrinin nəzarətsiz şəkildə tətbiqi nəticəsində yaranır. Buna habelə o fakt da təkan verir ki, antibiotikrezistentliyin qlobal inkişaf meyli fonunda ümumilikdə son illərdə bütün dünyada antibakterial preparatlara qarşı nozokominal infeksiyaların törədicilərinin davamlığı xeyli artmışdır (WHO, 2019: 6). Xəstəxanadaxili infeksiyaların törədiciləri «hospital ştam» adını almışdır, çünki stasionarda epidemik prosesi törədən kulturalar bir sıra xarakter əlamətlərlə fərqlənirlər: virulentliyin yüksək olması və nəticədə antibiotiklərə, dezinfektantlara, ətraf mühit amillərinə qarşı az tələbkarlıq və sürətlə böyümə imkanı. Məsələn, psevdomonadlar və klebsiellalar nəm mühitdə – inhalyatorlarda, duru dərman formalarında, əl-üzyuyanların səthində, kranlarda, nəm yığışdırma materialında sürətlə inkişaf edə bilərlər (Kundapur, 2022: 3). Xəstəxanadaxili infeksiyaların strukturu stasionarın profilindən, xəstələrin qrupundan və tətbiq olunan antibiotiklərin spektrindən asılıdır (Khalequzzaman, 2017: 12).

Hospital infeksiyaların törədicilərinin yoluxma mexanizmi və yolları stasionarın profilindən, xəstələrin kontingentindən, müalicə-diaqnostik prosedurların və manipulyasiyaların həcmindən asılıdır. Müasir çoxmərtəbəli korpuslarda böyük sayda xəstələrin və heyətin toplanması hava-damcı və hava-toz yoluxma yollarının həyata keçirilməsi üçün əlverişli şərait yaradır ki, bu da hava axını vasitəsilə baş verir. Hava axını qısa müddətdə tərkibində törədici olan aerozolu dəhliz və pilləkənlər boyunca daşıyır. Tibb heyətinin əlləri, ağlar, xəstələrə qulluq əşyaları, tibb alətləri və aparatları vasitəsilə infeksiya məişət-təmas yolu ilə də yayılır. Törədicilərin qida yoluxma yolu qida bloklarının işi, qida məhsullarının və hazır yeməklərin hazırlanması və ya saxlanması texnologiyasının pozuması zamanı həyata keçir (Novosad, 2020: 313).

İrinli-iltihabi və ya irinli-septiki xəstəxanadaxili infeksiyalar cərrahi əməliyyatlar, inyeksiyalar, doğuş və abortlar zamanı qanın köçürülməsi, hemodializ, damarların kateterizasiyası və s. əməliyyatlar aparıldıqda yoluxma nəticəsində inkişaf edir. İnkişaf edən xəstəxanadaxili infeksiyaların 40%-ə qədəri sidik- cinsiyyət yollarının infeksiyalarının payına düşür və bu əsas etibarilə (80%-ə qədər) kateterlərin və drenajların istifadəsi ilə bağlıdır. Onlar 2/3 halda qram-mənfi mikroorqanizmlərlə və əsasən E.coli ilə şərtlənir. ÜST-ün məlumatlarına görə, sidik-cinsiyyət yollarını zədələyən hospital infeksiyaların törədiciləri arasında bağırsaq çöpünün xüsusi çəkisi 38%,

protey – 17,5%, göy-yaşıl irin çöpləri – 11,6%, klebsiellalar – 8,5% və enterobakterlər – 6,4% təşkil edir (WHO, 2019: 8).

Tənəffüs yollarının xəstəxanadaxili infeksiyaları yüksək letallığı (50-70%) ilə səciyyələnir. Onu şərtləndirən törədicilər içərisində P.aeruginosa, S.aureus, K.pneumoniae, Acinebacter spp., nadir hallarda – anaeroblar, L.pneumophila, A və B qrip virusları, respirator-sensitial viruslar və göbələklər rast gəlir. Stasionar şəraitində, hansı ki, zəif şəxslər uzun müddət ərzində şüa terapiyası və ya antibiotiklər alırlar, qeyri-patogen floranın – dəri və selikli qişaların daimi sakinlərinin sürətlə çoxalması baş verə bilər. Xəstələr içərisində bir yaşa qədər uşaqlar və 60 yaşdan yuxarı şəxslər üstünlük təşkil edir. Angiogen infeksiyanın inkişafına şəkərli diabet, dərman vasitələri, zədələrlə və s. şərtlənən immunsupressiya təkan verir (Agaba, 2019: 8).

Mamalıq stasionarında xəstəxanadaxili infeksiyalar hamilə qadınlarda infeksiya ocaqlarının yüksək tezliyi ilə müəyyən edilir ki, bu da antenatal patologiyanın: dölün yoluxucu xəstəliklərinin, ölü doğuşların, yarımçıq doğuşların, dölün bətndaxili inkişafının ləngiməsi və inkişaf anomaliyalarının risk amili sayılır. Dölün yoluxmasının artmasına reproduktiv yaşda hormonal kontraseptiv vasitələrin uzun müddət istifadəsi, ağır ekstragenital patologiya, hamiləliyin pozulmasının hormonal və cərrahi üsulları, dölün bətndaxili vəziyyətinin qiymətləndirilməsi üçün invaziv metodların işlədilməsi təkan verir, belə ki, onlar hamiləlik zamanı infeksion-iltihabi ağırlaşmaların inkişaf riskini və sonradan dölün yoluxmasını artırır (Ağayev, 2022: 9).

## Nəticə

Xəstəxanadaxili infeksiyaların diaqnostikası törədicilərin mikrobioloji metodlarla, o cümlədən molekulyar-genetik metodların vasitəsilə aşkarlanmasına əsaslanmışdır. Törədicilərin tipləşdirilməsi alovlanmanı səciyyələndirməyə, yəni infeksiya mənbəyini, yoluxma mexanizmini və onların rezervuarını təyin etməyə imkan verir. Əksepidemik tədbirlər mərhələsində mikrobioloji tədqiqatların əsasında nəzarət həyata keçirilir və aparılan işin effektivliyi qiymətləndirilir. Xəstəxanadaxili infeksiyaların kəskin alovlanmaları bir ştam tərəfindən törədilir, onlar alovlanma ilə əlaqəsi olmayan sporadik xəstələnmə hallarından fərqlənirlər

Xəstəxanadaxili infeksiyaların qarşısının alınması və onlarla mübarizə məqsədilə xüsusi tədbirlər sistemi işlənir, onların arasında sanitar-gigiyenik tədbirlərə mühüm rol ayrılır. Bunların içərisində xəstəxanalar üzərində sanitar nəzarətin aparılması, xüsusilə qida blokunun, məhsulların daşınmasını yerinə yetirən nəqliyyatın sanitar-texniki vəziyyəti, inventarın və qabların saxlanması, qidanın hazırlanması texnologiyasının gözlənilməsi, onun realizasiyası müddətlərinin, qabların yuyulması, dezinfeksiya qaydalarının gözlənilməsi vacibdir.

## Ədəbiyyat

1. Ağayev, İ.Ə., Xələfli, X.N., Tağıyeva, F.Ş. (2022). Epidemiologiya (Milli rəhbərlik). Bakı.
2. Ağayev, İ.Ə., Xələfli, X.N., Tağıyeva F.Ş. (2022). Qeyri-infeksion xəstəliklərin epidemiologiyası. Bakı.
3. Boev, C., Kiss, E. (2017). Hospital-Acquired Infections: Current Trends and Prevention. Crit Care Nurs Clin North Am. 2017 March; Vol. 29(1), s.51-65.
4. Cilloniz, C., Dominedo, C., Torres, A. (2019). An overview of guidelines for the management of hospital-acquired and ventilator-associated pneumonia caused by multidrug-resistant Gram-negative bacteria. Curr Opin Infect Dis.
5. Stiller, A., Schroder, C., Gropmann, A. (2017). ICU ward design and nosocomial infection rates: a cross-sectional study in Germany. J Hosp Infect.
6. Bell, T., O'Grady, N.P. (2017). Prevention of Central Line-Associated Bloodstream Infections. Infect Dis Clin North Am.
7. Flores-Mireles, A., Hreha, T.N., Hunstad, D.A. (2019). Pathophysiology, Treatment, and Prevention of Catheter-Associated Urinary Tract Infection. Top Spinal Cord Inj Rehabil.
8. WHO. (2019). Ten threats to global health https://www.who.int/news-room/spotlight/ten-threats-to-global-health-in-2019

9. Kundapur, B., Modi, P., Shenoy, l. (2022). Activity adaptation towards control of selected noncommunicable diseases-A detailed part of large community trial in rural areas of India. J Fam Med Prim Care.
10. Khalequzzaman, M., Chiang, C., Hoque, B.A. (2017). Population profile and residential environment of an urban poor community in Dhaka, Bangladesh. J.Environ Health Prev Med.
11. Novosad, S.A., Fike, L., Dudeck, M.A. (2020). Pathogens causing central-line-associated bloodstream infections in acute-care hospitals-United States. Infect Control Hosp Epidemiol.
12. Agaba, E.I., Akanbi, M.O., Agaba, P.A. (2019). A survey of non-communicable diseases and their risk factors among university employees: a single institutional study. South African Journal of Diabetes and Vascular Disease.

Göndərilib: 28.10.2023 Qəbul edilib: 30.11.2023

DOI: https://doi.org/10.36719/2707-1146/39/12-15

**Səadət Əliyeva**
Azərbaycan Tibb Universiteti
magistrant
sadt7814@gmail.com
**Gülnarə Daşdəmirova**
Azərbaycan Tibb Universiteti
biologiya elmlər doktoru
gulnara.dashdamirova@gmail.com

# UZUN SÜRƏN NEONATAL SARILIQ HALLARININ BİOKİMYƏVİ XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Hal-hazırda yeni doğulmuş körpələrin ən aktual problemlərindən biri də neonatal sarılıqlardır. Neonatal sarılıqlar vaxtında doğulmuş körpələrin təxminən yarısında, vaxtından erkən doğulmuş körpələrin isə 75-80 faizində görülə bilər.

Neonatal hiperbilirubinemiya neonatal dövrdə, xüsusən də həyatın ilk həftəsində rast gəlinən ümumi klinik problemdir. Yenidoğulmuşların təxminən 8%-dən 11%-ə qədər hiperbilirubinemiya inkişaf edir. Həyatın ilk həftəsində ümumi serum bilirubin (ÜSB) yaşa görə 95 faizdən yuxarı qalxdıqda bu, hiperbilirubinemiya kimi qəbul ediləcək.

Yenidoğulmuşlarda sarılıq bilirubinin təsiriylə dəri və sklera rənginin sarımtıl rəngə çevrilməsidir. Təqdim olunan məqalədə hiperbilirubinemiyanın əsas səbəbləri və diaqnostikası haqqında ətraflı məlumat verilmişdir.

***Açar sözlər:*** *hiperbilirubineya, neonatal, sarılıq, bilirubin, hemoliz, Bilirubinometr*

**Saadat Aliyeva**
Azerbaijan Medical University
master student
humayhasanova25@gmail.com
**Gulnara Dashdamirova**
Azerbaijan Medical University
PhD in biology
gulnara.dashdamirova@gmail.com

## Biochemical characteristics of prolonged neonatal jaundice cases

**Abstract**

Currently, one of the most urgent problems of newborn babies is neonatal jaundice. Neonatal jaundice can be seen in about half of term babies and in 75-80 percent of premature babies.

Neonatal hyperbilirubinemia is a common clinical problem in the neonatal period, especially in the first week of life. About 8% to 11% of newborns develop hyperbilirubinemia. When the total serum bilirubin (TSB) rises above the 95th percentile for age in the first week of life, it will be considered hyperbilirubinemia.

Jaundice in newborns is the turning of the skin and sclera into a yellowish color due to the effect of bilirubin. The presented article provides detailed information on the main causes and diagnosis of hyperbilirubinemia.

***Keywords:*** *hyperbilirubinemia, neonatal jaundice, bilirubin , hemolysis, bilirubinometer*

## Giriş

Hiperbilirubinemiya qanda bilirubinin yığılması ilə gözlərin və dərinin sarı rənginin dəyişməsinə səbəb olan bir vəziyyət-sarılıq deyilir (Şahbazova, Şirinova, 2012). Konyuqasiya olunmuş hiperbilirubinemiyanın əsas səbəbləri intrahepatik xolestaz və öd yollarının qaraciyərdənkənar obstruksiyasıdır, sonuncu isə bilirubinin bağırsaqlara keçməsinin qarşısını alır.

Yenidoğulmuşlarda bilirubinin aşağı səviyyədə olması adi haldır və heç bir problem yaratmır və həyatın ilk həftəsində öz-özünə keçəcək (Əfəndiyev, İslamzadə, 2009). Ancaq vaxtından əvvəl doğuş, infeksiya və ya müəyyən qan xəstəlikləri kimi bəzi şərtlər bilirubinin zəhərli səviyyəyə sürətlə yığılmasına səbəb ola bilər.

Hiperbilirubinemiyanın səbəbindən asılı olaraq, sarılıq doğuş zamanı və ya ondan sonra istənilən vaxt görünə bilər.

Bilirubin qırmızı qan hüceyrələrinin parçalanması zamanı yaranan təbii əlavə məhsuldur. Yetkinlərin qaraciyəri konyuqasiya olunmamış bilirubini ifraz olunan konyuqə formaya çevirir. Hamiləlik dövründə plasenta bilirubini ifraz edir, lakin körpə doğulduqdan sonra körpənin yetişməmiş qaraciyəri bu rolu öz üzərinə götürməlidir (Mesiç, Milas, Medimurec, Rimar, 2014). Hiperbilirubinemiya və sarılığın bir neçə səbəbi var:

- **Fizioloji sarılıq.** Fizioloji sarılıq, qaraciyərin yetişməməsi səbəbindən körpənin həyatının ilk günlərində bilirubini ifraz etmək qabiliyyətinin məhdudlaşmasına "normal" cavab olaraq baş verir. Bu ümumiyyətlə həyatın ilk həftəsində həll olunur.
- **Ana südü ilə qidalanmanın uğursuzluğu sarılıq.** Ana südü ilə qidalanmanın ilk bir neçə günündə ananın ana südü az olduğu və körpənin qidalanma problemi olduğu zaman, körpə susuz qala bilər. Bilirubin sidik və nəcislə xaric edildiyi üçün sidik ifrazının azalması və nəcisdə bilirubinin yığılmasına səbəb olur (Mishra, Agarwal, Deorari, Paul, 2008). Tam müddətli körpələrdə tez-tez rast gəlinsə də, vaxtından əvvəl doğulmuş körpələr və gec doğulmuş körpələr bu problemə daha çox həssasdırlar, çünki koordinasiya olunmamış əmmə və asan yorulma ola bilər.
- **Ana südü sarılığı.** Ana südü ilə qidalanan körpələrin təxminən 2 faizində ilk həftədən sonra sarılıq yaranır. Təxminən iki həftəlik yaşda zirvəyə çatır və üç ilə on iki həftəyə qədər davam edə bilər. Ana südü sarılığının ana südündəki bilirubinin bağırsaq traktından reabsorbsiyasını artıran bir maddədən qaynaqlandığı düşünülür. Ana südü ilə qidalanma ümumiyyətlə davam edə bilər və ya yalnız qısa müddətə kəsilə bilər.
- **Hemolizdən sarılıq.** Sarılıq qırmızı qan hüceyrələrinin parçalanmasının artması halında baş verə bilər.Körpənin doğuş zamanı qançırlar və ya hematoma inkişaf etdirdiyi təqdirdə hemolizin artması da baş verə bilər.
- **Qeyri-adekvat qaraciyər funksiyası ilə əlaqəli sarılıq.** Sarılıq infeksiya və digər amillər səbəbiylə uzun müddət qaraciyər funksiyasının pozulması ilə bağlı ola bilər.

Hiperbilirubinemiya çox yaygındır, müddətli yeni doğulmuşların təxminən 60 faizində və vaxtından əvvəl doğulmuş körpələrin 80 faizində sarılıq inkişaf edir (Bowman, 2003).

Bilirubin sadəcə dəhşətli nəticələrə səbəb olan narahatedici molekul deyil, sidik turşusu kimi bilirubin yenidoğulmuşun bioloji sistemində dövr edən mühüm antioksidantdır (Nag, Halder, Chaudhuri, Adhikary, Mazumder, 2009; Yousefi, Rahimi, Barikbin, Toossi, Lotfi, Hedayati, 2011; Barikbin, Yousefi, Rahimi, Hedayati, Razavi, Lotfi, 2011). Bununla belə, yüksək bilirubin səviyyələri mərkəzi sinir sisteminin inkişafı üçün toksik ola bilər və hətta vaxtından əvvəl doğulmuş körpələrdə (Paludetto, Mansi, Raimondi, Romano, Crivaro, Bussi, D'Ambrosio, 2002; Boo, İshak, 2007; Nass, Frank, 2010) davranış və nevroloji pozulmalara (neyrotoksiklik və ya Kernikterus) səbəb ola bilər.

Artan bilirubin körpənin gözlərinin, selikli qişasının və dərisinin sarı rəngə boyanması ilə özünü göstərir, adətən başdan başlayaraq aşağıya doğru hərəkət edir.

Yenidoğulmuşlarda sarılıq doğum çəkisi, hamiləlik müddəti, qişaların vaxtından əvvəl qopması, ananın yoluxucu xəstəlikləri və ya hamiləlik zamanı digər xəstəliklər, mənşəyinin müxtəlif olması, buna görə də müxtəlif növlərə malik olması kimi müxtəlif parametrlərə görə ola bilər (Mesiç, Milas, Medimurec, Rimar, 2014).

Sarılığın görünüşünün vaxtı diaqnoza kömək edir. İlk 12-24 saat ərzində görünən sarılıq ciddi ola bilər və erkən müalicə tələb edə bilər. Sarılıq ikinci və ya üçüncü gündə ortaya çıxdıqda, adətən "fizioloji" və ya susuzlaşdırma ilə əlaqədardır. Sarılıq ilk həftənin sonuna doğru görünsə, bunun səbəbi infeksiya ola bilər. İkinci həftədə sarılığın daha sonra görünməsi, tez-tez ana südü ilə qidalanma ilə əlaqədardır, lakin başqa səbəblər də ola bilər.

Hiperbilirubinemiya üçün diaqnostik prosedurlar aşağıdakıları əhatə edə bilər:

- **Birbaşa və dolayı bilirubinin səviyyəsi.** Qan testi bilirubinin qaraciyər tərəfindən digər maddələrlə bağlı olub olmadığını (birbaşa) və ya qan dövranında dövran etdiyini (dolayı) müəyyən edə bilər (Watson, Rogers, 1961).
- Bilirubinin səviyyəsi biokimyəvi üsulla, Bilimetr və ya transkutan bilirubinometrlə yoxlanıla bilər (Yamanouchi, Yamauchi, Igarashi, 1980, Maisels, Ostrea, Touch, Clune, Cepeda, Kring, 2004)
- Bilirubinin qiymətləndirilməsi üçün qızıl standart metod van den Berq reaksiyasına əsaslanan ümumi və konyuqa bilirubinin qiymətləndirilməsidir (Bosschaart, Kok, Newsum, Ouwenee, Mentink, van Leeuwen, 2012).
- **Bilimetr**-Spektrofotometriya Bilimetrin əsasını təşkil edir və serumda ümumi bilirubini qiymətləndirir.
- **Transkutan bilirubinometr**-Bu üsul qeyri-invazivdir və dəridə bilirubinin boyanmasından çox dalğa uzunluğunda spektral əksetmə prinsipinə əsaslanır (Krişnasami, Bakri, 2009).
- Körpənin çox və ya çox az qırmızı qan hüceyrəsi olub olmadığını müəyyən etmək üçün qırmızı qan hüceyrələrinin sayından istifadə edilə bilər.
- Retikulositlərin sayı qırmızı qan hüceyrələrinin istehsalının göstəricisi olan gənc qırmızı qan hüceyrələrinin sayını təyin edir.
- Qan qrupu və ABO və ya Rh uyğunsuzluğu üçün test (Coomb testi).

## Nəticə

Yenidoğulmuşlarda hiperbilirubinemiya daha şiddətlidir. Buna görə xəstəliyin düzgün diaqnozu və müalicəsi üçün həm valideynlər, həm də həkimlər tərəfindən ehtiyat tədbirləri görülməlidir. Dövlət və ictimai səhiyyə təşkilatları yenidoğulmuşların sarılığı ilə bağlı analar üçün seminarlar, seminarlar və təlimlər təşkil etməlidir. Tərəfdaşlar nikahdan əvvəl ABO qan qruplarını, eləcə də Rh faktorunu yoxlamalıdırlar.

## Ədəbiyyat

1. Şirinova, D., Şahbazova, N. (2012). Yenidoğulmuşların ilkin reanimasiyası.
2. Əfəndiyev, A.M., İslamzadə, F.Q. (2009). İnsan biokimyasının əsasları.
3. Mesiç, I., Milas,V., Medimurec, M., Rimar, Z. (2014). Yenidoğulmuşlarda konjuge olmayan patoloji sarılıq. Col Antropol, Vol. 38 (1), s.173-8, [PubMed - Google Scholar].
4. Mishra, S., Agarwal, R., Deorari, A.K., Paul, V.K. (2008). Yenidoğulmuşlarda sarılıq. Indian J.Pediatr.
5. Bowman, J. (2003). Otuz beş illik Rh profilaktikası. Transfuziya.
6. Nag, N., Halder, S., Chaudhuri, R., Adhikary, S., Mazumder, S. (2009). Neonatal sarılıqda bilirubinin antioksidant rolu və siçovullarda eksperimental olaraq induksiya edilmiş sarılığa şirin əhəng qabığının etanolik ekstraktının təsiri. Indian J Biochem Biophys.
7. Yousefi, M., Rahimi, H., Barikbin, B., Toossi, P., Lotfi, S., Hedayati M. (2011). Urik turşusu: pemfiqus vulqarisi olan xəstələrdə yeni bir antioksidant.
8. Barikbin, B., Yousefi, M., Rahimi, H., Hedayati, M., Razavi, S.M., Lotfi, S. (2011). Liken planuslu xəstələrdə antioksidan status. Clin Exp Dermatol.
9. Paludetto, R., Mansi, G., Raimondi, F., Romano, A., Crivaro, V., Bussi, M., D'Ambrosio, G. (2002). Orta dərəcədə hiperbilirubinemiya neonatal davranışın müvəqqəti dəyişməsinə səbəb olur. Pediatriya.
10. Boo, N.Y., İshak, S. (2007). Bilicheck transkutan bilirubinometrindən istifadə edərək ağır hiperbilirubinemiyanın proqnozlaşdırılması. J.Paediatr uşaq sağlamlığı.

11. Nass, R.D., Frank, Y. (2010). Uşaq Xəstəliklərinin Bilişsel və Davranış Anomaliyaları. 1-ci nəşr Oxford University Press,[Google Scholar].
12. Mesiç, I., Milas, V., Medimurec, M., Rimar, Z. (2014). Yenidoğulmuşlarda konjuge olmayan patoloji sarılıq. Col Antropol.
13. Watson, D., Rogers, J.A. (1961). Plazma bilirubinin analizinin altı nümayəndəsi metodunun tədqiqi. J.Clin Pathol.
14. Yamanouchi, I., Yamauchi, Y., Igarashi, I. (1980). Transkutan bilirubinometriya: Okayama Milli Xəstəxanasında qeyri-invaziv transkutan bilirubin sayğacının ilkin tədqiqatları. Pediatriya.
15. Maisels, M.J., Ostrea E.M., Touch, S., Clune, S.E., Cepeda, E., Kring, E. (2004). Yeni transkutan bilirubinometrin qiymətləndirilməsi. Pediatriya.
16. Krişnasami, M, Bakri, D.R. (2009). Qeyri-invaziv, əl ilə transkutan bilirubinometr. Tibbi İnkişaf Şöbəsi, Səhiyyə Nazirliyi, Malayziya, [Google Scholar].


Göndərilib: 09.10.2023 Qəbul edilib: 02.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/39/16-19

**Rübayə Əbilova**
Azərbaycan Tibb Universiteti
biologiya üzrə fəlsəfə doktoru
filosof8083@gmail.com
**Firəngiz Quliyeva**
Azərbaycan Tibb Universiteti
biologiya üzrə fəlsəfə doktoru
fquliyeva1@amu.edu.az
**Gülnarə Cəfərova**
Azərbaycan Tibb Universiteti
biologiya üzrə fəlsəfə doktoru
xeyalcafarov4@gmail.com

# ŞƏKƏRLİ DİABETİN PATOGENEZİNDƏ ŞAXƏLİ AMİN TURŞULARININ ƏHƏMİYYƏTİ

## Xülasə

Hal-hazırda şəkərli diabet (ŞD) endokrin sistemi xəstəlikləri işərisində geniş yayılmasına, müxtəlif orqan və toxumalarda yaratdığı kliniki fəsadların ağırlıq dərəcəsinə görə aktual tibbi-sosial problem olaraq qalır. ŞD zamanı aminturşuların, xüsusilə də yan zənciri şaxəli olan aminturşuların metabolizmində ciddi dəyişikliklər baş verir. ŞD xəstələrində aminturşu metabolizminin xüsusiyyətlərinin öyrənilməsi məqsədilə eksperimental şəkərli diabet modeli yaradılmış 9 dovşanın qan plazmasında leysin, izoleysin və valin aminturşularının konsenrasiyası analiz edilmişdir. Dovşanlarda ŞD yaratmaq üçün alloksan-tetrahidrat nembutal (“Merk”) narkoz yolu ilə damar daxilinə yeridilmişdir. Alınan nəticələr göstərdi ki, leysinin, izoleysinin və valinin konsentrasiyası, müvafiq olaraq 55,2% ($p<0,001$), 32,9% ($p=0,045$) və 51,2% ($p<0,001$) kontrola nisbətən statistik əhəmiyyətli artmışdır.

***Açar sözlər:*** *şəkərli diabet, eksperimental dovşan modeli, leysin, izoleysin və valin*

**Rubaya Abilova**
Azerbaijan Medical University
PhD in biology
filosof8083@gmail.com
**Firangiz Guliyeva**
Azerbaijan Medical University
PhD in biology
fguliyeva1@amu.edu.az
**Gulnara Jafarova**
Azerbaijan Medical University
PhD in biology
khayascafarov4@gmail.com

# The importance of branched-chain amino acids in the pathogenesis of diabetes

## Abstract

Currently, diabetes mellitus (DM) remains an actual medical and social problem due to its wide spread among endocrine system diseases, and the severity of clinical complications it causes in various organs and tissues. During DM, there are serious changes in the metabolism of amino acids, especially amino acids with branched side chains. İn the blood plasma of 9 rabbits created experimental diabetes model was analyzed the concentration of leucine, isoleucine and valine

amino acids in order to study the characteristics of amino acid metabolism in DM patients. Alloxan-tetrahydrate nembutal ("Merck") was injected intravenously under anesthesia to induce DM in rabbits. The obtained results showed that the concentration of leucine, isoleucine and valine increased statistically significantly compared to the control by 55.2% ($p<0.001$), 32.9% ($p=0.045$) and 51.2% ($p<0.001$), respectively.

***Keywords:*** *diabetes mellitus, experimental rabbit model, leucine, isoleucine and valine*

## Giriş

Endokrin sistemi xəstəlikləri, onların patogenezi, diaqnostika üsulları və terapiyası ildən-ilə tibbi-sosial problem olaraq daha aktual olur. Bunun səbəbi xəstəliyin daim və çox artması ilə əlaqədardır. Ən çox yayılan endokrin xəstəliklərindən biri şəkərli diabetdir (ŞD). Ümumdünya Səhiyyə Təşkilatının (ÜST) proqnozlarına görə 2025-ci ilə qədər bu xəstəlikdən dünyada 380 milyon insan əziyyət çəkəcək (1).

ŞD müasir dövrün qlobal problemlərindən biridir. Bütün dünyada tibb cəmiyyətinin qarşısında bu xəstəliyin profilaktikası, diaqnostikası və müalicəsinin yeni yollarını axtarmaq kimi məsələlər qoyluur. Bundan əlavə, klinik əlamətlərini, parametrlərini və patogenetik mexanizmlərini öyrənmək üçün endokrinologiya sahəsində yeni modellərin axtarılıb-tapılmasına zərurət yaranır. Tibbin müasir inkişaf mərhələsində şəkərli diabetin eksperimental modelləşdirilməsi xəstəliyin təkcə ardıcıl olaraq bütün patofizioloji mərhələlərini izləmək deyil, həm də kifayət qədər uzunmüddətli model olmalıdır ki, yeni dərman preparatlarının antidiabetik xüsusiyyətini tədqiq etmək mümkün olsun (Samotrueva, 2019: 49; Modjeyko, 2013: 26; Kaplin, 2023:50).

Şəkərli diabet zamanı aminturşu mübadiləsinin pozulması, hormonal statusun pozulması ilə əlaqədar olub, mürrəkkəb patogenez zəncirinin bir hissəsini təşkil edir (5). ŞD zamanı sərbəst aminturşularının qanda və sidikdə öyrənilməsi diaqnostik əhəmiyyət kəsb etməklə yanaşı, həm də mühüm proqnostik əhəmiyyət daşıyır, düzgün müalicəvi taktikanın seçilməsinə yardım edir. İnsulinə qarşı rezistentliyi olan insanlarda yan zənciri şaxəli olan aminturşular və onların metabolitlərinin səviyyəsi yüksək olur. Belə ki, zülal onu təşkil edən aminturşulara parçalanır və təbii olaraq qanda yan zənciri şaxəli olan aminturşuların miqdarı da yüksəlir. Müəyyən olunmuşdur ki, insulinə qarşı rezistentliyi olan insanlarda şaxəli aminturşularının miqdarı yüksəlir. Bu da onunla əlaqədardır ki, ŞD xəstəliyinin nəticəsində şaxəli aminturşuların katabolizmini stimulə edən fermentlərin genlərinin ekspressiyası zəifləyir. Genlərin ekspressiyası – bu elə bir prosesdir ki, xəstəliyin gedisi zamanı DNT-nin bir hissəsində olan informasiya RNT-nin və ya müəyyən zülalın funksional məhsuluna çevrilir. Genlərin ekspressiyası hüceyrələrə imkan verir ki, öz struktur və funksional xüsusiyyətlərinə nəzarət etsin. Şaxəli aminturşulara leysin, izoleysin və valin aiddir (Lu, 2009: 14; Lee, 2016: 582). Bu aminturşular, xüsusən, leysin əzələ zülallarının (yəni əzələ toxumasını) qurulmasını stimulə edir. Bir sıra müəlliflər apardıqları tədqiqatlar nəticəsində sübut etmişlər ki, şaxəli aminturşular metabolik, ürək-damar, serebro-vaskulyar, böyrək kimi xəstəliklər üçün biomarker rolunu oynayır (Chen, 2016: 594; Wurtz, 2013: 648; Seibert, 2015).

ŞD xəstəliyinin patogenezini, klinikasını və profilaktikasını aşkar etməkdə eksperimental diabetalogiya böyük əhəmiyyət kəsb edir. Eksperimental ŞD modeli təkcə xəstəliyin patofiziologiyasını öyrənmək deyil, həmçinin müxtəlif preparatların antidiabetik təsrinin mexanizmini öyrənməyə də əsas verir. Hal-hazırda eksperimentral şəkərli diabetin bir neçə modelindən istifadə olunur. Onların əsasları budur (Samotrueva, 2019; Modjeyko, 2013: 26):

1. Cərrahi metod;
2. Kimyəvi metod;
3. Endokrin metod;
4. İmmun modeli;
5. Genetik model.

Müasir eksperimental diabetologiyada şəkərli diabetin kimyəvi modeli geniş yayılmışdır. Ədəbiyyat məlumatlarına görə, 1996-2006-cı illər ərzində xəstəliyin müxtəlif aspektlərini öyrənmək üçün kimyəvi vasitə kimi 69% sterptozonosindən və 31% alloksandan istifadə etmişlər. 1943-cü

ildə ilk dəfə olaraq müəyyən edilmişdir ki, alloksanın dovşanlara yeridilməsi onların mədəaltı vəzisinin adacıqlarına seçici təsir etməklə şəkərli diabetin klassik simptomlarının inkişafına səbəb olur. Bundan sonra alloksana maraq kəskin artmağa başladı. Alloksan sidik turşusunun parçalanma məhsulu olub, ağ kristallik maddədir, havada çəhrayı rəng alır. Maddə o zaman diabetik təsirə malik olur ki, o, heyvana damardaxili, dərialtı, əzələdaxili yeridilsin. Alloksandan I tip şəkərli diabeti öyrənmək üçün istifadə olunur. Dozanın effektivliyi heyvanın növündən, onun yeridilmə üsulundan və qidalanmasından asılıdır. Dovşanlar üçün damardaxili yeridilmə dozası 150-200 mq/nq, qarın boşluğuna yeridilmə dozası 500-800 mq/nq təşkil edir (Samotrueva, 2019: 49; Modjeyko, 2013: 26; Kaplin, 2023: 50).

***İşin məqsədi.*** Eksperimental diabet zamanı dovşanların qan plazmasında şaxəli aminturşularının miqdarını kəmiyyətcə və keyfiyyətcə öyrənmək olmuşdur.

***Material və metodlar.*** Eksperimental şəkərli diabet modeli yaradılmış 9 dovşanın qan plazmasından istifadə edilmişdir. Təcrübədə çəkisi 1,7-2,2 kq olan dovşanlardan istifadə edilmişdir. Alloksan-tetrahidrat fizioloji məhlulda həll edilmişdir. Dovşanlarda ŞD yaratmaq üçün alloksan-tetrahidrat nembutal (“Merk”) narkoz yolu ilə damar daxilinə yeridilmişdir. Diabet dörd həftə davam etmiş və bu müddət ərzində hər həftə qlükozanın səviyyəsi indikator zolaqların (“Detroxtix”, “Miles”, Böyük Britaniya) vasitəsilə qiymətləndirilmişdir. Qanda qlükozanın miqdarı 26,0-30,0 mmol/l arasında tərəddüd etmişdir (diabet 28,3±0,7). Kontrol qrupa müvafiq çəkiyə malik 10 dovşan daxil edilmişdir. Qlükozanın səviyyəsi onlarda 5,6±0,4 mmol/l olmuşdur. Dovşanların qan plazmasında aminturşu spektri ikisütunlu yarımavtomat mayeli xromotoqraf KLA-3B “Hitachi” (Yaponiya) analizatorunda təyin olunmuşdur.

***Alınmış nəticələr və onların müzakirəsi.*** Müəyyən edilmisdir ki, dovşanlarda diabetin inkişafı zamanı şaxəli zəncirli əvəzolunmayan aminturşuların konsentrasiyası normaya nisbətən artır. Belə ki leysinin konsentrasiyası 1,020±0,078 mq% (kontrol-1,630±0,230 mq%), izoleysinin konsentrasiyası – 1,050±0,160 mq% (kontrol - 0,790±0,050 mq%) və valinin konsentrasiyası 2,101±0,390 mq% (1,389±0,160 mq%) olmuşdur. Alınan nəticələr göstərdi ki, leysinin, izoleysinin və valinin konsentrasiyası, müvafiq olaraq 55,2% ($p<0,001$), 32,9% ($p=0,045$) və 51,2% ($p<0,001$) kontrola nisbətən statistik əhəmiyyətli artmışdır (cədvəl ).

**Cədvəl 1.**
**Eksperimental şəkərli diabet zamanı dovşanların qan plazmasında şaxəli aminturşuların miqdarı (mq%), M±m.**

| Aminturşular | Kontrol<br>n=10 | Şəkərli diabet<br>n=9 |
|---|---|---|
| Valin | 1,389±0,160 | 2,101±0,390<br>p<0,001 |
| Leysin | 1,020±0,078 | 1,630±0,230<br>p<0,001 |
| Izoleysin | 0,790±0,050 | 1,050±0,160<br>p=0,045 |

Müxtəlif yollarla diabeti induksiya etmək mümkün olsa da, bu modellərin heç biri xəstəliyin mahiyyətini tam əks etdirmir, ŞD-in bütün xüsusiyyətlərini imitasiya edə bilmir. Heyvanlarda diabetin eksperimental modelini yaratmaq müxtəlif dərman preparatlarının effektliyini öyrənməyə imkan verər.

Məlum olur ki, ŞD həm ayrılıqda götürülmüş bir fərdin, həm də bütövlükdə populyasiyanın həyat keyfiyyətini aşağı salır. Tədqiqatın nəticələri göstərir ki, şaxəli aminturşuların metabolizminə yönəlmiş müalicə strategiyası ŞD-in yaranması riskini azalda bilir (Vangipurapu, 2016: 1253; Bloomgarden, 2018: 350). Bunun üçün mövcud dərman preparatlarının təsirini öyrənmək sahəsində kliniki tədqiqatların aparılması məqsədə uyğun olardı (Samotrueva, 2019: 49; Modjeyko, 2013: 26; Kaplin, 2023: 50).

## Nəticə

Beləliklə, xəstəlik yüksək sosial əhəmiyyət kəsb etdiyi üçün endokrin sistemi xəstəliklərinin eksperimental modellərini öyrənmək aktual olaraq qalır. Bu yolla mövcud patologiyanın qanunauyğunluqlarını, inkişaf xüsusiyyətlərini, onların ağırlaşmalarını aşkar etmək, profilaktika və müalicə üsullarını işləyib hazırlamaq, həmçinin yeni birləşmələrin təsir mexanizmlərini öyrənilməklə onların tətbiqinə nail olmaq olar.

## Ədəbiyyat

1. Sapra, A., Bhandari, P. (2023). Diabetes, 2023 Jun 21. In: StatPearls [Internet]. Treasure Island (FL): StatPearls Publishing; 2023 Jan. PMID: 31855345.
2. Samotrueva, M.A., Sergalieva, M.U. (2019). Diabetes mellitus: Features of experimental modelling. Astrakhan medical journal. Vol.14 (3), pp.45-57 (in Russian).
3. Mozhejko, L.A. (2013). Eksperimental'nye modeli dlya izucheniya saharnogo diabeta chast' I. alloksanovyj diabet Zhurnal Grodnenskogo gosudarstvennogo medicinskogo universiteta, no. Vol.3 (43), pp.26-29 (in Russian).
4. Kaplin, A.N. (2023). Novaya eksperimental'naya model' saharnogo diabeta dlya izucheniya geptacionnoj patologii CHelovek i ego zdorov'e, t. 26, № 2, pp.50-58 (in Russian).
5. American Diabetes Association. (2020). Management of Diabetes in Pregnancy: Standards of Medical Care in Diabetes-2020. Diabetes Care. Vol.43 (Suppl 1), pp.183-192.
6. Lu, Y., Wang, Y., Liang, X., Zou, L., Ong, C.N., Yuan, J.M., Koh, W.P, Pan, A. (2019). Serum Amino Acids in Association with Prevalent and Incident Type 2 Diabetes in A Chinese Population. Metabolites. January, Vol.14; 9(1), 14 p.
7. Lee, C.C., Watkins, S.M., Lorenzo, C., Wagenknecht, L.E., Il'yasova, D., Chen, Y.D., Haffner, S.M., Hanley, A.J. (2016). Branched-chain amino acids and insulin metabolism: The Insulin Resistance Atherosclerosis Study (IRAS) *Diabetes Care.* Vol.39, pp.582-588.
8. Chen, T., Ni, Y., Ma, X., Bao, Y., Liu, J., Huang, F., Hu, C., Xie, G., Zhao, A., Jia, W. (2016). Branched-chain and aromatic amino acid profiles and diabetes risk in Chinese populations. Sci. Rep. Vol.6: 20594.
9. Wurtz, P., Soininen, P., Kangas, A.J., Ronnemaa, T., Lehtimaki, T., Kahonen, M., Viikari, J.S., Raitakari, O.T., Ala-Korpela, M. (2013). Branched-chain and aromatic amino acids are predictors of insulin resistance in young adults. *Diabetes Care.* Vol.36, pp.648-655.
10. Seibert, R., Abbasi, F., Hantash, F.M., Caulfield, M.P., Reaven, G., Kim, S.H. (2015). Relationship between insulin resistance and amino acids in women and men. Physiol Rep. Vol.3.
11. Vangipurapu, J., Stancáková, A., Smith, U., Kuusisto, J., Laakso, M. (2019). Nine Amino Acids Are Associated With Decreased Insulin Secretion and Elevated Glucose Levels in a 7.4-Year Follow-up Study of 5,181 Finnish Men. *Diabetes* 1 June, Vol.68 (6), pp.1353-1358.
12. Bloomgarden, Z. (2018). Diabetes and branched-chain amino acids: What is the link? J Diabetes, May, Vol.10(5), pp.350-352.

Göndərilib: 07.11.2023 Qəbul edilib: 01.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/39/20-26

**Sevinc Mərdanova**
V.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
biologiya üzrə fəlsəfə doktoru
sevmar72@mail.ru
**Nəzrin Məcidova**
V.Axundov adına Elmi - Tədqiqat Tibbi Profilaktika İnstitutu
nazmjdm@gmail.com
**Telli Şirinova**
V.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
telli_shirinova@mail.ru

# MÜASİR TƏBABƏTDƏ KOİNFEKSİYA

**Xülasə**

Müasir dünyada koinfeksiyalar təkcə geniş yayılmasına görə deyil, həm də onların kliniki qiymətləndirilməsinə, müalicə və profilaktikasına etibarlı metodoloji yanaşmanın hələ formalaşmadığına görə getdikcə daha çox tibbi-sosial əhəmiyyət kəsb edir. Belə metodoloji yanaşmanın əsasında patogen mikroorqanizmlərin bir-biri ilə birbaşa və ya immun sisteminin vasitəçiliyi ilə qarşılıqlı təsir mexanizmləri haqqında biliklər durmalıdır. Koinfeksiya zamanı ən çox rast gəlinən patogenlər bakteriya və viruslardır və onların birləşməsi yalnız infeksiya prosesin daha ağır gedişatına səbəb olmur, həm də onun ağırlaşmalarının və letal nəticələrin tezliyini əhəmiyyətli dərəcədə artırır. Bu icmalda pespirator infeksiyalar, şiş prosesləri, insan immunçatışmazlığı virusunun assosiantlarının timsalında onların yüksək rəngarəngliyini göstərən bakterial-virus koinfeksiyalarda patogenlərin qarşılıqlı təsir formaları nəzərdən keçirilir. Koinfeksiyaedici agentlərin qarşılıqlı təsirlər mexanizmləri arasında virusların bakteriyaların toksin əmələ gəlməsinə, bakteriyaların isə virusların yoluxuculuğuna təsirinə xüsusi diqqət yetirilir. Koinfeksiyaedici mikroorqanizmlər epitelial maneəni birlikdə dəf etməyə kömək edir, immun sisteminin hüceyrələrinin funksiyalarını qarşılıqlı faydalı şəkildə modifikasiya edə və bu patogenlərin immun cavabından qaçmasına səbəb ola bilir. Müəyyən edilmişdir ki, bir sıra onkogen virusların və HİV-in genlərinin ekspressiyası bakteriyaların yaratdığı epigenom dəyişikliklərlə tənzimlənir ki, bu da kanserogen təsirə səbəb olur. Göstərilmişdir ki, koinfeksiya zamanı bakterial-virus qarşılıqlı təsirlərin müxtəlifliyi nəinki onların vaxtında tanınması və nəzarət edilməsi üçün yeni yanaşmalar tələb edir, həm də koinfeksiya ilə mübarizənin yeni biotexnologiyalarını və strategiyalarını yaradır ki, onların da inkişaf etdirilməsinə bütün dünyada böyük diqqət yetirilir.

***Açar sözlər:*** *koinfeksiya, opportunist infeksiyalar, staphylococcus aureus, immun sistem*

**Sevinj Mardanova**
Scientific Researh Institute of Medical Prophylaxis named V.Akhundov
PhD in biology
sevmar72@mail.ru
**Nazrin Majidova**
Scientific Researh Institute of Medical Prophylaxis named V.Akhundov
nazmjdm@gmail.com
**Telli Shirinova**
Scientific Researh Institute of Medical Prophylaxis named V.Akhundov
telli_shirinova@mail.ru

## Coinfection in modern medicine

### Abstract

In the modern world, co-infections are becoming more and more medical and social important not only because of their widespread distribution, but also because a reliable methodological approach to their clinical evaluation, treatment and prevention has not yet been formed. Such a methodological approach should be based on knowledge about the mechanisms of interaction of pathogenic microorganisms with each other directly and through the mediation of the immune system. The most common pathogens during co-infection are bacteria and viruses, and their combination not only leads to a more severe course of the infection process, but also significantly increases the frequency of its complications and lethal outcomes. In this review, the forms of interaction of pathogens in bacterial-viral coinfections, which show their high diversity, are considered in the example of respiratory infections, tumor processes, human immunodeficiency virus associates.

Among the mechanisms of interaction of co-infectious agents, special attention is paid to the effect of viruses on the toxin production of bacteria, and the effect of bacteria on the infectivity of viruses. Coinfecting microorganisms help to cross the epithelial barrier together, can modify the functions of cells of the immune system in a mutually beneficial way and cause these pathogens to evade the immune response. It has been found that gene expression of a number of oncogenic viruses and HIV is regulated by bacteria-induced epigenomic changes, leading to carcinogenic effects. It has been shown that the diversity of bacterial-viral interactions during coinfection not only requires new approaches for their timely recognition and control, but also creates new biotechnologies and strategies for combating coinfection, which are receiving great attention worldwide.

***Keywords:*** *coinfection, opportunistic infections, staphylococcus aureus, immune system*

### Giriş

Müasir dünyada koinfeksiya problemi ən aktual problemlərdən biri hesab edilir, çünki bu günə qədər dünya əhalisinin altıda biri bu birləşmiş patologiyadan əziyyət çəkir (Griffiths, Pedersen, Fenton , 2011: 200-206).

Koinfeksiyaedici mikroorqanizmlər və parazitlər arasında bütün taksonomik qruplar (viruslar, bakteriyalar, ibtidailər, göbələklər, helmintlər) təmsil olunur. Lakin belə halların yarısından çoxunda koinfeksiyaedici agent kimi bakteriyalar (53,4%) çıxış edir, koinfeksiyaların təxminən üçdə biri (34,7%) viruslarla bağlıdır (Griffiths, Pedersen, Fenton, 2011: 200-206). Bakterial-virus assosiasiyaların xüsusi kliniki əhəmiyyəti bundan irəli gəlir. Eyni zamanda problemin çox mühüm tərəfini koinfeksiyaedici agentlərin bir-biri ilə və insan orqanizmi ilə qarşılıqlı təsir formaları təşkil edir.

Çox vaxt koinfeksiyalar superinfeksiya, yəni bir mikroorqanizmin yaratdığı mövcud xəstəlik fonunda başqa bir növ və ya ştamın mikroorqanizmi ilə yoluxma prosesi şəklində özünü göstərir (Gupta, Tang, Tran, Kadouri, 2016). Hazırda məlumdur ki, koinfeksiyaedici patogenlər bir-biri ilə birbaşa, habelə sahib orqanizmin immun sistemi vasitəsilə qarşılıqlı əlaqədə ola bilir. Monoinfeksiya ilə müqayisədə bu qarşılıqlı təsirlər yoluxucu prosesin gedişinə, onun proqressiya dərəcəsinə, inkişafına nəzarət etmək imkanına əhəmiyyətli dərəcədə təsir göstərir (Stanton, 2013:111-113). Koinfeksiyaedici prosesi həm patogenlərin xassələrinə, həm də makroorqanizmin vəziyyətinə təsir edə bildiyindən (Griffiths, Pedersen, Fenton, 2011: 200-206), belə yoluxucu xəstəliklərə differensial yanaşma ilə yanaşı, xüsusi monitorinq şərtləri tələb olunur, lakin məsələnin bu tərəfi hələ kifayət qədər öyrənilməmişdir (Pullan, Brooker, 2008: 783-794; Steinmann, Utzinger, 2010: 21-50), problemin hazırkı vəziyyəti isə dərin təhlil tələb edir.

*Staphylococcus aureus tarix boyu mühüm insan patogeni olmuşdur və hazırda bütün dünyada bakterial infeksiyaların əsas səbəbidir. S. aureus kiçik dəri infeksiyalarından tutmuş fatal*

Mulçalama (saman mulçası) variantında isə tam yetişmə fazasında bir bitkinin orta boyu 361,7 sm, bir bitkidən çıxan qıcanın kütləsi 382,3 qr, bir qıcadan çıxan dənin kütləsi 321,9 qr, dən çıxımı 85,6 %, 1000 dənin kütləsi isə 391,2 qr-a bərabər olmuşdur.



**Şəkil 2. Samanla mulçalanmış variantda qarğıdalı cücərtiləri**

Cədvəl 1-dən görünür ki, bütün öyrənilən quruluş elementləri üzrə ən yüksək göstəricilər tirəyə səpin texnologiyasında əldə edilmişdir.

**Qarğıdalının dən məhsuluna tirəyə səpin və mulçalama texnologiyalarının təsiri.** İqlim dəyişikliyi fonunda qarğıdalı bitkisinin adaptiv texnologiya (tirəyə səpin və mulçalama) ilə becərilməsinin dən məhsuluna təsiri Samux rayonu şəraitində bu vaxta qədər öyrənilməyib. Bunu nəzərə alaraq biz rayonun Qarayeri qəsəbəsində qlobal istiləşmənin neqativ təsirlərini (yüksək temperatur və quraqlıq) azaltmaq üçün adaptiv texnologiyaların qarğıdalının dən məhsuluna təsirinin öyrənilməsini tədqiq etdik. Qarğıdalının tam yetişkənlik fazasında təkrarlar üzrə hər bölmədən ayrıca məhsul yığılıb, çəkilib, alınan məhsul hektara çevrilmişdir. Əldə olunan nəticələr Şəkil 3-də diaqram formasında verilmişdir.

Məhsuldarlıq göstəricilərinə nəzər salsaq görərik ki, adaptiv texnologiyalar qarğıdalının məhsuldarlığına müsbət təsir göstərmişdir. Belə ki, fon variantında hektardan orta hesabla 66,5 sentner, tirəyə səpin variantında 86,1 sentner, mulçalama variantında isə 79,3 sentner dən məhsulu əldə edilmişdir (Şəkil 3). Ən yüksək dən məhsulu qarğıdalının tirəyə səpin variantında əldə edilmişdir.



**Şəkil 3. Tirəyə səpin və mulçalama texnologiyalarının qarğıdalının dən məhsuldarlığına təsiri, sent/ha, 2022-ci il**

Bu isə onunla izah olunur ki, tirəyə səpin daha erkən (adi səpindən 10 gün əvvəl) aparıldığından qarğıdalının çiçəkləmə və dənə dolma fazaları yayın qızmar və quraq dövrünə təsadüf etmir. Fenoloji müşahidələr zamanı aşkar edilmişdir ki, vegetasiya müddəti fon variantına (113 gün) və mulçalama

variantına (115 gün) nisbətən tirəyə səpin variantında 98 gün olmuşdur və dənlik qarğıdalı nəzarətə (fon) nisbətən 15 gün daha tez yetişmişdir. Bundan başqa tirədə nəmlik ehtiyatı daha yaxşı qorunub saxlandığından bitkinin qida və suya olan tələbatı normal ödənmişdir.

## Nəticə

1) Samux rayonu şəraitində qarğıdalının "Kəpəz" sortunun adaptiv texnologiya (tirəyə səpin və mulçalama) ilə becərilməsi zamanı səpini tirələrdə daha erkən müddətdə (05 aprel) aparmaq mümkün olur və bu da bitkinin temperatura həssas olan çiçəkləmə - mayalanma fazalarının yayın isti və quraq iqliminə nisbətən az məruz qalmasına səbəb olur.

2) Tirədə nəmlik ehtiyatı daha yaxşı qorunub saxlandığından bitkinin qida və suya olan tələbatı normal ödənmişdir.

3) Qarğıdalının tirəyə səpin variantında tam yetişmə fazasında bir bitkinin orta hesabla hündürlüyü 366,4 sm, bir bitkidən çıxan qıcanın kütləsi 384,6 qr, bir qıcadan çıxan dənin kütləsi 329,1 qr, dən çıxımı 87,4 %, 1000 dənin kütləsi isə 398,5 qr-a bərabər olmuşdur.

4) Nəzarət (fon) variantında hektardan orta hesabla 66,5 sentner, tirəyə səpin variantında 86,1 sentner, mulçalama variantında isə 79,3 sentner dən məhsulu əldə edilmişdir. Ən yüksək dən məhsulu qarğıdalının tirəyə səpin variantında əldə edilmişdir.

5) Tirəyə səpin daha erkən (adi səpindən 10 gün əvvəl) aparıldığından qarğıdalının çiçəkləmə və dənə dolma fazaları yayın qızmar və quraq dövrünə təsadüf etmir.

6) Vegetasiya müddəti fon variantına (113 gün) və mulçalama variantına (115 gün) nisbətən tirəyə səpin variantında 98 gün olmuşdur və dənlik qarğıdalı nəzarətə (fon) nisbətən 15 gün daha tez yetişmişdir.

7) Samanla mulçalama zamanı torpaqdan suyun buxarlanması azalır və bu da torpaqda nəmlik ehtiyatının qorunmasına şərait yaradır.

## Ədəbiyyat

1. Behbudova, S.P. (1995). Qarğıdalı. (dərs vəsaiti). Bakı, 56 s.
2. Məmmədov, Q.Y., İsmayılov, M.M. (2012). Bitkiçilik. Şərq-Qərb nəşr. Bakı, 356 s.
3. Xəlilova, H.M. (1973). Bitkiçilik üzrə laboratoriya məşğələləri. Bakı: "Maarif", 368 s.
4. Wang, Q., Li, Y., Alva, A. (2010). Cropping Systems to Improve Carbon Sequestration for Mitigation of Climate Change. Journal of Environmental Protection, Vol. 1, pp.207-215.
5. https://www.insidescience.org/news/how-us-corn-farmers-adapted-climate-change
6. Məmmədov, V.Ə. (2010). Gəncə-Qazax bölgəsinin suvarılan açıq-şabalıdı (açıq boz qəhvəyi) torpaqlarında qarğıdalının becərilmə texnologiyasının optimallaşdırılması. Aqrar elmlər üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiya. Gəncə, 185 s.

7. Liu, C.A., Jin, S.L., Zhou, L.M., Jia, Y. (2009). Effects of plastic film mulch and tillage on maize productivity and soil parameters. European Journal of Agronomy, 31, pp.241-249. https://doi.org/10.1016/j.eja.2009.08.004
8. Zhou, L.M., Li, F.M., Jin, S.L., Song, Y.J. (2009). How two ridges and the furrow mulched with plastic film affect soil water, soil temperature and yield of maize on the semiarid Loess Plateau of China. Field Crop. Res. 2009, 113, pp.41-47. https://doi.org/10.1016/j.fcr.2009.04.005
9. Kong, M., Jia, Y., Gu, Yan-Jie , Cheng-Long, H. (2020). How Film Mulch Increases the Corn Yield by Improving the Soil Moisture and Temperature in the Early Growing Period in a Cool, Semi-Arid Area. Agronomy Journal, Vol 10(8), 1195 p. https://doi.org/10.3390/agronomy10081195
10. Ram, H., Singh, Y., Saini, K.S., Kler, D.S. (2012). Agronomic and economic evaluation of permanent raised beds, no tillage and straw mulching for an irrigated maize-wheat system in northwest India. Expl. Agric., Vol. 48 (1), pp.21-38. Cambridge University Press 2011. https://doi.org/10.1017/S0014479711000809
11. Azərbaycan Respublikasının Aqroiqlim Atlası. (1993). Azərbaycan Respublikası Dövlət Geodeziya və Xəritəçəkmə Komitəsi. Bakı, (Ə.S. Əyyubovun redaktəsi ilə), 104 s.
12. Şıxlinski, Ə.M. (1979). Yağıntılar, havanın temperaturu, küləyin istiqaməti, əsas iqlim tipləri. Azərb. SSR atlası. Moskva, s.15-16.

Göndərilib: 27.10.2023 Qəbul edilib: 29.11.2023

DOI: https://doi.org/10.36719/2707-1146/39/73-76

**Fatma Şahbazova**
"Dendrologiya bağı" Publik Hüquqi Şəxs
fatmasahbazova5@gmail.com

# ALBİZA JULİBRİSSİN DURAZZ. NÖVÜNÜN ABŞERON ƏRAZİSİNDƏ BİOEKOLOJİ XÜSUSİYYƏTLƏRİNİN TƏYİNİ

**Xülasə**

Bitkilər müxtəlif ekoloji şəraitlərdə yaşamağa uyğunlaşmışdır. Onları səhradan tropik yağış meşələrinə qədər müxtəlif mühitlərdə görmək olar. Bitkilərin bioekoloji xüsusiyyətlərini təyin etmək və həmin xüsusiyyətlərə uyğun yetişdirmək onların həyat keyfiyyətini artırır, sağlam şəraitdə mövcud olmasına imkan verir. Ölkəmizin iqlim şəraitində inkişaf edən bir sıra dəyərli, relikt bitki növləri vardır. Tədqiqat obyekti olaraq seçilmiş *Albizia julibrissin* Durazz. bitkisi də onlardan biridir. Azərbaycanda əsasən Talış ərazisində geniş yayılmış növ "Lənkəran akasiyası", "İpək akasiya", "Güləbrişin" kimi də tanınır. Abşeronda yerləşən Dendrologiya bağı ərazisində bu qiymətli bitkinin bioekoloji xüsusiyyətləri öyrənilmişdir.

***Açar sözlər:*** *Albizia julibrissin Durazz., relikt bitki, bioekoloji xüsusiyyətlər, dekorativ bitki, dərman bitkisi*

**Fatma Shahbazova**
"Garden of Dendrology" Public Legal Entity
fatmasahbazova5@gmail.com

## Determination of bioecological characteristics of the species Albizia julibrissin Durazz. in the Absheron area

**Abstract**

Plants are adapted to live in different environmental conditions. They can be found in a wide range of environments, from deserts to tropical rainforests. Determining the bioecological characteristics of plants and growing them according to those characteristics increases their quality of life and allows them to exist in healthy conditions. There are a number of valuable, relic plant species that develop in the climatic conditions of our country. Albizia julibrissin Durazz plant was selected as the research object that is one of them. It is also known as "Lankaran acacia", "Silk acacia", and "Gulabrishin", which is widespread in Azerbaijan, mainly in Talish territory. The bioecological characteristics of this valuable plant were studied in the garden of Dendrology located in Absheron.

***Keywords:*** *Albizia julibrissin Durazz., relict plant, bioecological features, decorative plant, medicinal plant*

## Giriş

*Albizia julibrissin* Durazz. *Fabaceae* Lindl. fəsiləsinin *Albizia* Durazz. cinsinə aid ağac növüdür. Vətəni Asiya olan bitkiyə dünyanın subtropik və tropik ərazilərindən başqa, mülayim iqlim zonalarında rast gəlinir. Azərbaycanda isə əsasən Talış ərazisində geniş yayılmışdır. "Lənkəran akasiyası", "İpək akasiya", "Güləbrişin" kimi tanınan növ 1989-cu ildə Azərbaycanın "Qırmızı kitab"-ına daxil edilmişdir (Məmmədov, 2016: 14). 1749-cu ildə bu ağacı İstanbulda görən və Florensiyaya aparan Fiippledel Albizzi şərəfinə bitki xaricdə Albizia adı ilə tanınır (2). Bu növün elmi adı fars dilindən tərcümədə "gul-i abrişam", yəni "ipək gülü"dür. İpək akasiyası Mərdəkan Denrarisində 1945-ci ildən toxumla introduksiya olunur.

*Albizia julibrissin* Durazz. ortaboylu, geniş çətirli, xoş ətirli, parlaq çəhrayı çiçəklərə malik, yarpaqlarını tökən ağacdır. Estetik cəhətdən xoş görünüşü olan bu ağacın cavan zoğları yaşıl rəngli, hamar qabıqlıdır. Parlaq zoğlar üzərində ağ rəngli qovuqcuqlar vardır. Bitkinin üzərində yarpaq

saplağının izi görünür (Qurbanov, İsgəndər 2015: 11). Gövdəsinin qabığı boz rəngli, uzununa çatlıdır. İpək akasiyası işıq və isti sevən bitki olub, 10 il ərzində 9 m hündürlüyə və 14 sm diametrə çataraq, yalnız 4-5 yaşdan etibarən çiçəkləyib, meyvə verir. 18-25 sm uzunluğunda olan yarpaqları növbəli düzülmüş, ikiqat, cütləlәkvaridir (Məmmədov, 2010: 232).



**Şəkil 1.** ***Albizia julibrissin*** **Durazz**

Yarpaqların hər biri iyirmi-otuz cüt yarpaqcıqdan ibarətdir, onların kənarları tamdır və ümumi yarpaq sapında qarşılıqlı düzülmüşdür. Birinci hissədəki yarpaqcıqlar 8-12 cüt olub, uzunsov oraqvarı şəkilli, 5 (8-10) - 15 mm uzunluqda və 1,5 (3,4)- 4,5 mm enindədir. İkinci hissədəki yarpaqcıqlar isə 15-20 (35) cüt olub, üst tərəfdən tünd, altdan açıq-yaşıldır, çılpaqdır və ya alt tərəfdən az və ya çox sıx yumşaq tüklü, kənarı kirpikvaridir (Məmmədov, İsgəndər, Talıbov, 2016: 84). Toxunmanın təsirindən, gecələr və ya yağışlı günlərdə onlar yavaş-yavaş bağlanır. Çiçəkləri xırda, 5 şüalı, başcıqvari çiçək qrupu əmələ gətirir. Çiçək qrupları iri, mürəkkəb süpürgələrdə birləşir.



**Şəkil 2.** ***Albizia julibrissin*** **Durazz. növünün çiçələri**

Bitki həşəratlar vasitəsilə tozlanır. Tozcuqları allergik reaksiyalara səbəb ola bilər. Başcıq çiçək qrupunun kənarlarında erkəkcikli, mərkəzində isə ikicinsli çiçəklər yerləşir. Erkəkcikli çiçəklərin çiçək yanlığı yaşılımtıl-sarı rəngdədir. İkicinsli çiçəklərin tacı isə uzun boruşəkilli, kasacıqadan 8-10 dəfə uzun, xaricdən ipəkvari tüklərlə örtülüdür. Erkəkciklər sayca çoxdur, uzun, nazik saplı, tacdan çox irəli çıxmış, çəhrayı rəngdədir (Məmmədov, İsgəndər, Talıbov, 2016: 85). Həşəratların bitkiyə cəlb olunmasında onların böyük rolu var. Tozluqları xırda, dörd kameralı, sarıdır. Onlar salxıma oxşar tozcuq qovuqlarına yapışıqdır. Dişiciyi bir ədəddir, telvari sütunludur. Bitki iyun-iyul aylarında çiçəkləyir və uzun çiçəkləmə dövrünə malikdir. Yay boyu çiçəklər bitkinin üzərində qalır. Meyvələri payız aylarında yetişir. Paxla formalı toxumları yastı, çılpaq xətvari, 16-20 sm uzunluqda və 20-25 mm enindədir (Məmmədov, 2010: 232). Adətən bir paxlanın içərisində 5-10 ədəd toxum olur. Toxumlar bir neçə il cücərmə qabiliyyətini saxlayır. Onlar külək və su vasitəsilə yayıla bilir. Yetkin ağacın dibinə düşmüş toxumlarından qısa zamanda yeni cücərtilər əmələ gəlir. Toxumlar payızda toplanır və yaza qədər sərin, quru yerdə saxlanılır.

Abşeronda yerləşən "Dendrologiya bağı" ərazisində mövcud olan *Albizia julibrissin* Durazz. növü üzərində müşahidələr aparılmış, bioekoloji xüsusiyyətləri təyin edilmişdir. Bundan əlavə, "Dendrologiya bağı"-nın "Meşə ekosistemləri" laboratoriyasının əməkdaşları tərəfindən tədqiq edilən Lənkəran akasiyası bitkisinin bağ ərazisində mövcud olan 2 illik 2 fərqli ölçülərə malik nüsxələri üzərində avqust ayında ölçmə işləri də aparılmışdır. Ölçmələrin orta göstəriciləri Cədvəl 1-də göstərilmişdir.

**Cədvəl 1.**
**Lənkəran akasiyası bitkisinin 2 illik 2 müxtəlif ölçüyə malik nümunələrinin ölçüləri.**

| | Kök boynundan şaxələnən budağa qədər məsafə | Gövdə diametri | Ən böyük yarpaqcıq uzunluğu | Ən kiçik yarpaqcıq uzunluğu | Ümumi yarpaq uzunluğu |
|---|---|---|---|---|---|
| Nümunə 1 | 125 sm | 3 sm | 9 sm | 3 sm | 29 sm |
| Nümunə 2 | 55 sm | 2 sm | 9,5 sm | 4,5 sm | 33 sm |

Bitki işıqsevən, istisevən, torpağa az tələbkar, küləyə davamsız, tez böyüyəndir. Yaxşı qurudulmuş, humusla zəngin torpaq və ya substratda yaxşı inkişaf edir. Quraqlığa davamlı bitkidir. Bütün soyuğa həsass bitkilər kimi Lənkəran akasiyası da yaşlandıqca şaxtaya davamlılığı artır. Onu ilk bir neçə il qışda soyuqdan qorumaq tövsiyyə olunur. Məsələn: kök sahəsi yarpaq təbəqəsi ilə örtülməlidir, gövdə isə yun və ya matla bükülməlidir (6). Lənkəran akasiyası bitki xəstəlikləri və zərərvericilərinə qarşı nisbətən davamlıdır. Açıq, küləkli yerdə yaxşı inkişaf edə bilmir, çünki güclü küləklərin təsirinə qarşı həssasdır.

## Nəticə

İşıqsevən, istisevən, torpağa az tələbkar, küləyə davamsız, tez böyüyən bitkidir. Lənkəran akasiyası üçün torpaq və ya substrat yaxşı qurudulmalı və humusla zəngin olmalıdır. Quraqlığa davamlı bitkidir. Bütün soyuğa həsass bitkilər kimi Lənkəran akasiyası da yaşlandıqca şaxtaya davamlılığı artır. Onu ilk bir neçə il qışda soyuqdan qorumaq tövsiyyə olunur. Məsələn: kök sahəsi yarpaq təbəqəsi ilə örtülməlidir, gövdə isə yun və ya matla bükülməlidir. Lənkəran akasiyası bitki xəstəlikləri və zərərvericilərinə qarşı nisbətən davamlıdır. Açıq, küləkli yerdə yaxşı inkişaf edə bilmir, çünki güclü küləklərin təsirinə qarşı həssasdır. Bitkinin becərildiyi yerlərdə onun qonşuluğunda elə əkin materialları əkmək lazımdır ki, həmin bitkilərin çətirləri, gövdə və budaqları şaquli istiqamətdə inkişaf edən olsun.

Bütün ağaclar kimi bu ağacın da inkişaf edib böyüməsi üçün budanmaya ehtiyacı var. Qışın sonundan yazın əvvəlinə qədər zədələnmiş, qırıq və çox uzun olan budaqları budamaq lazımdır. Bundan başqa, xəstəliyə yoluxmuş budaqları da mütəmadi olaraq ağacdan kənarlaşdırmaq lazımdır. Hər budama işindən sonra alətlər dezinfeksiya edilməlidir.

"Dendrologiya Bağı" ərazisində *Albizia julibrissin* Durazz. növünün ikiillik və beşillik nüsxələrinə də rast gəlinir. Bu nüsxələr açıq sahədə tam günəş işığı düşən və ya qismən kölgəli yerlərdə əkilmişdir. Bağın ərazisində bitki yaşıllaşdırmada tək və qrup əkinlərində istifadə olunur.

Dekorativ, ballı bitkidir, xoş ətirlidir. Bir çox paxlalı bitki kimi Lənkəran akasiyasının da müəyyən torpaq bakteriyaları ilə simbiotik əlaqəsi var. Bu bakteriyalar köklərdə düyünlər əmələ gətirir və atmosfer azotunu fiksasiya edir (7). Fiksasiya olunan azotun bir hissəsi böyüyən bitki tərəfindən istifadə olunur, bir hissəsi isə yaxınlıqda böyüyən digər bitkilər tərəfindən də istifadə edilə bilər. Qabığından alınmış cövhərdən xalq təbabətində geniş istifadə edilir. Qabığında 7-8 % aşı maddəsi, saponin, həmçinin boyaq maddəsi vardır (Məmmədov, 2016: 14). Onun şirəsindən təbabətdə mədə-bağırsaq xəstəliklərinin müalicəsində, çiçəyinin bişməsindən öskürəyə qarşı istifadə olunur. Çiçəklər adətən yazın sonunda və payızın əvvəlində çiçəklənmə zamanı yığılır və sonra istifadə üçün qurudulur (8). Yuxusuzluq, əsəbilik, təngnəfəslik və zəif yaddaşın müalicəsində istifadə zamanı daxilə qəbul olunur. Bitkinin antidepresan, anksiyolitik və sedativ təsirlərinin arxasında duran əsas mexanizmlərdən biri kimi görünən serotonin reseptorlarına (xüsusən 5-HT1A reseptorlarına) təsir etmək qabiliyyətidir (9). Zədələrin və şişliklərin müalicəsində istifadə zamanı isə xaricə tətbiq olunur. Bitkidən əldə edilən saqqız ekstraktı çibanlar, yaralar və bu kimi məqsədlər üçün məlhəm kimi, həmçinin sınıq və burxulmalarda qoruyucu vasitə kimi istifadə olunur (10).

Lənkəran akasiyasının qabığı və çiçəkləri qədim Çin təbabətində dərman kimi istifadə olunurdu. Qabığın ekstraktı ağciyər xəstəlikləri və ağrıları zamanı, dəri xoralarını, yaraları müalicə etmək üçün sakitləşdirici və iltihab əleyhinə vasitə kimi istifadə olunurdu (11). Bundan başqa o, qan dövranının tənzimlənməsinə də kömək edir. Asiya xalqları yuxusuzluğu müalicə etmək üçün xəstələrə *Albizia julibrissin* qabığı ekstraktı verirdilər (12). Bitkinin çiçəkləri depressiya və yuxusuzluğu müalicə etmək üçün istifadə edilmişdir (7). Onun toxumları yağ mənbəyidir və bundan əlavə heyvandarlıqda qida kimi istifadə olunur (13).

Qabığından alınan sarı rəng ipək və yun parçaların boyanması üçün yararlıdır. Bitki həmçinin qumlu torpaqlarda eroziyanın qarşısını almaq məqsədi ilə də becərilir (2).

Abşeronun torpaq-iqlim şəraitinə tam davamlı, dekorativ növ olduğu üçün park və bağların yaşıllaşdırılmasında bəzək bitkisi kimi istifadə edilməsi məqsədyönlü hesab edilir.

## Ədəbiyyat

1. Məmmədov, T. (2016). Azərbaycan dendrroflorası III cild. Bakı: Elm.
2. https://apps.worldagroforestry.org/treedb/AFTPDFS/Albizia_julibrissin.PDF
3. Qurbanov, M., İsgəndər, E. (2015). Azərbaycanın nadir oduncaqlı bitkilərinin bioekologiyası, çoxaldılması və mühafizəsi. Bakı: Təhsil.
4. Məmmədov, T. (2010). Abşeronun ağac və kolları. Bakı: Elm və təhsil.
5. Məmmədov, T., İsgəndər, E., Talıbov, T. (2016). Azərbaycanın nadir ağac və kol bitkiləri. Bakı: Elm.
6. https://www.mygarden.com/plants/albizie/persian-silk-tree-mimosa
7. https://practicalplants.org/wiki/albizia_julibrissin/
8. https://www.allthingshealth.com/en-us/glossary/albizia-flower/
9. https://www.ncbi.nlm.nih.gov/pmc/articles/PMC10230641/
10. https://garden.rcplondon.ac.uk/plant/Details/53
11. https://www.mdpi.com/1420-3049/25/9/2065
12. https://www.hindawi.com/journals/ecam/2011/236341/
13. https://www.researchgate.net/publication/233926990_Characteristics_chemical_composition_and_utilisation_of_Albizia_julibrissin_seed_oil

Göndərilib: 17.10.2023 Qəbul edilib: 04.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/39/77-81

**Gülnarə Abbasova**
Azərbaycan Dövlət Aqrar Universiteti
abbasovag13@gmail.com

# ŞƏMKİR REGİONUNDA SOYA BİTKİSİNİN GÜBRƏ NORMASINDAN ASILI OLARAQ MƏHSULDARLIĞIN DƏYİŞMƏSİNƏ TƏSİRİNİN ÖYRƏNİLMƏSİ

## Xülasə

Soya bitkisinin becərilmə texnologiyasında yaxşı məhsul əldə etmək üçün gübrələrə müəyyən diqqət tələb olunur. Gübrə norması torpaq analizlərinnin nəticələrindən asılı olaraq, gübrə nisbətinin düzgün hesablanması soya sahələri üçün tətbiq edərkən diqqət yetirməli olduğumuz vacib elemetlərdəndir. Soya becərmə texnologiyasında müvəffəqiyyət əldə etmək üçün gübrə tətbiqinin torpağın qida səviyyəsinə uyğun tənzimlənməsi çox vacibdir.

***Açar sözlər:*** *soya, gübrə, inokulyasiya,becərmə, məhsuldarlıq, torpaq*

**Gulnara Abbasova**
Azerbaijan State Agrarian University
abbasovag13@gmail.com

## Studying the impact of soybean plant on variable productivity depending on fertilizer rate in Shamkir region

## Abstract

In order to achieve optimal yields in soybean cultivation in the Shamkir region, careful attention to fertilizer application is essential. The proper calculation of fertilizer rates based on soil analysis results is a crucial element when implementing fertilizer ratios for soybean fields. Adjusting fertilizer application according to soil nutrient levels is vital for achieving success in soybean cultivation technology.

***Keywords:*** *soybean, fertilizer, inoculation, cultivation, yield, soil*

## Giriş

Soya paxlalı bitki kimi əsas xüsusiyyəti odur ki, onun köklərində yerləşmiş fır bakteriyalarının köməyi ilə havadan sərbəst azotu mənimsəyir və bununla da torpağı azotla zənginləşdirir (Fedotov, Kadirov Şedrina, Stolarov, 2015: 133).

Müasir kənd təsərrüfatında soya bitkilərinin atmosfer azotunu fiksasiya etməyə və bununla da torpaq mikroflorasının inkişafı üçün şəraiti yaxşılaşdırmaq və onun fəaliyyətini gücləndirməklə torpağın münbitliyini artırmağa qadir olduğuna inanılır. Bundan əlavə, soya kök sisteminin inkişafında az həll olunan torpaq fosfor birləşmələrini udmaq və istifadə etmək üçün kifayət qədər qabiliyyətli olduğu sübut edilmişdir (2). Müşahidələr göstərmişdir ki, soya becərilməsi torpağın müxtəlif xüsusiyyətlərinə təsir göstərir. Bunun səbəbi iki əsas amil ola bilər: 1) dərin və yaxşı inkişaf edən kök sistemi; 2) yerüstü hissələri topladıqdan sonra kök şəklində torpaqda böyük miqdarda biokütlənin qalması və bir çox becərilən sortların yığılmasından əvvəl tökülmüş yarpaqlar şəklində üzvi maddələrin verilməsi. Köklərin yerüstü hissələrə nisbətinin cəmi 1:3 olduğunu fərz etsək belə, məhsul çəkisinin ümumi bitki çəkisinə nisbəti 0,33 olan 2 ton taxıl yığımı, bir qayda olaraq, 2 ton kök biokütləsi əldə edir. yeraltı və düşmüş yarpaqlar şəklində daha 1 ton biokütlə. Təxminən dörd ay vegetasiya dövrü olan məhsula belə böyük miqdarda üzvi maddə əlavə etmək, şübhəsiz ki, torpağın xüsusiyyətlərinə təsir edəcək (Qabaqcıl ölkələrin təcrübəçiləri, 2014: 69).

Bununla belə, inokulasiyanın əhəmiyyətini nəzərə almadan, çox vaxt toxum əkmədən əvvəl nitragin ilə sirayətləndirilir. Nitragin əlavə edildikdə, aşılamanın kifayət qədər səmərəliliyini təmin

edən şərtlərin olmaması səbəbindən fırların meydana gəlməsi həmişə baş vermir (Aqrar terminlər lüğəti, 2019: 174).

Bu səbəblərdən Azərbaycanın bir çox bölgələrində soyada fırların olmaması müşahidə olunur. Qida maddələrinin çıxarılmasına dair əldə edilmiş təhlil məlumatları müəyyən edir ki, bu şəraitdə soya digər bitkilərlə müqayisədə torpaqdan 2-3 dəfə çox azot çıxarır.

Belə ki, bəzi ədəbiyyatların məlumatına görə məhsuldarlığı 18 s/ha olan soya paxlalarından azotun çıxarılması 165 kq/ha, qarğıdalı üçün 71 kq/ha, arpa üçün isə 51 kq/ha təşkil edib. Soyanın gübrələrə həssaslığı məsələsinə baxılarkən bu xüsusiyyət nəzərə alınmalıdır (Məmmədov, 2022: 99-111).

Təcrübə sahəsi Şəmkir regionunda yerləşir. Ərazinin bitki örtüyü müxtəlifdir. Yarımsəhra və quru bozqır (çöl) bitkiləri üstünlük təşkil edir. Ərazinin düzənlik hissəsi əsasən taxıl fəsiləsinə mənsub bitkilərdən təşkil olunmuşdur. Bölgədə geniş ərazini əhatə edən Ceyrançöl qış otlaqlarında yarımsəhra bitki qrupundan, əsasən efemerlər və efemeroidlər üstünlük təşkil edir. Ümumiyyətlə, bitki örtüyünün flora tərkibi olduqca kasıbdır. Səhra tipli bitki örtüyü yarımsəhra bitki örtüyünə nisbətən məhdud şəkildə yayılmışdır. Dağətəyi düzənliyin yuxarı sərhəddində və orta dağlıq qurşaqda bozqır bitki örtüyü əsasən çoxillik yabanı taxıl bitkilərindən təşkil olunmuşdur. Bölgənin torpaq ehtiyatları yüksək dərəcədə mənimsənildiyindən təbii bitki örtüyü məhdud şəkildə qorunub saxlanmışdır. Buna baxmayaraq ərazinin bitki örtüyü çox rəngarəngdir. Bölgədə geniş ərazini əhatə edən Ceyrançöl qış otlaqlarında yarımsəhra bitki qrupundan, əsasən efemerlər və efemeroidlər üstünlük təşkil edir. Ümumiyyətlə, bitki örtüyünün flora tərkibi olduqca kasıbdır. Səhra tipli bitki örtüyü yarımsəhra bitki örtüyünə nisbətən məhdud şəkildə yayılmışdır. Torpaqəmələgətirən süxurlar kobud qırıntılı prolüvial və allüvial-prolüvial gilli və gillicəli çöküntülərdən təşkil olun muşdur, bölgənin düzənlik hissəsində laylı qədim allüvial qumlu-gilli gətirmələrdən ibarətdir. İrəlidə qısa təsvir etdiyimiz torpaq əmələgətirən amillərin qarşılıqlı təsiri nəticəsində bölgənin müasir torpaq örtüyünün tərkibi formalaşmışdır (Məmmədov, 2007: 222-252).

Bu bölgədə 2020 – 2022 illərdə təcrübə qoyaraq, mineral gübrələrin soya məhsuldarlığına təsiri ilə məşğul olmuşuq. Həm mineral gübrələrə olan tələbat, həm də gübrələrin müxtəlif forma və dozalarının təsiri öyrənilmişdir. Bölgədəki qeyri-sabit rütubət zonası üçün xarakterik olan bu təcrübələrin nəticələri bitkinin gübrələrə son dərəcə zəif cavab verdiyini göstərir. Təcrübələrdə əldə edilən artımlar o qədər əhəmiyyətsizdir ki, onların praktiki əhəmiyyəti maraq cəzb etmir. Rayonda kifayət qədər rütubət zonasının düzənlik və dağətəyi hissələrində gübrə məsələləri həll edilmişdir (cədvəl 1).

Kifayət qədər nəmlik Şəmkir zonasıda mineral gübrələrin məhsul yığımına təsiri.

**Cədvəl 1.**

| Gübrələr | Şəmkir pivot 1 | Şəmkir pivot 2 | Şəmkir pivot 3 |
|---|---|---|---|
| Gürəsiz | 20 | 12.1 | 14.9 |
| Ammonium sulfat | 24 | - | - |
| Superfosfat | 18.9 | - | - |
| Ammonium sulfat + kalium duzu | 22.9 | - | - |
| Ammonium sulfat +superfosfat | 21.8 | 14.2 | 16.9 |
| Superfosfat + kalium duzu | 19 | 16.1 | 16.9 |
| Ammonium sulfat + superfosfat + kalium duzu | 20.9 | 13.3 | 15.3 |
| | | 16.5 | 15.2 |

Təqdim olunan məlumatlar göstərir ki, bu zonada soya ammonium sulfat şəklində tətbiq olunan azotun və ammonium sulfatın superfosfatla birgə tətbiqinə cavab verir. Təcrübələrin nəticələri müəyyən edir ki, soya üçün istifadə edilən bütün gübrələrdən azot gübrəsi, Şəmkir zonasında azot

və fosforun birgə tətbiqi ən yaxşı təsirə malikdir, məhsuldarlığın artmasında turşu gübrələri daha əhəmiyyətli olduğunu təmin etdi. Bu məlumatları təhlil edərkən qeyd etmək lazımdır ki, təcrübələrdə gübrələrdən istifadə texnikası mükəmməl deyildi. Gübrələrin tətbiqi dərinliyi kifayət deyildi. Onların təqdim olunma vaxtı da ən yaxşısı deyildi.

Bu şərtlər dəyişərsə, fosfat gübrələrinin effektivliyi fərqli ola bilər. Bundan əlavə, təqdim olunan nəticələr bakteriya fırlarının çox zəif formalaşması və ya onların tam olmaması ilə əldə edilmişdir. Əlavə tədqiqatlar göstərir ki, soyanın kökündə fırlar mövcuddur. Bunu 2022-ci ildə Yevlax rayonunda yerləşən sahəmizdə inokulyasiya olunmuş toxumlar istifadə edib əkin aparıldıqda müəyyən olunmuşdur. Gübrələrlə aparılan təcrübələrdə əldə etdiyimiz aşağıdakı məlumatlardan görmək olar (cədvəl 2).

**Cədvəl 2.**

| Gübrələr | Məhsul (t/ha) | Yaşıl kütlə (t/ha) | Ümumi (t/ha) |
|---|---|---|---|
| Azot və kalium | 15,0 | 15,3 | 30,3 |
| Azot, fosfor və kalium | 17,1 | 21,2 | 38.3 |
| Gürəsiz | | | |
| Superfosfat | 12.3 | | |
| | 13.6 | - | - |
| | | - | - |

Beləliklə, Şəmkir torpaqlarıda gübrələrin soyaya təsiri fır əmələ gəritən bakteriyaların mövcudluğundan çox asılıdır. Soya köklərində fırlar kifayət qədər formalaşması ilə fosfat gübrələrin müsbət təsiri özünü göstərir; olmadıqda və ya zəif formalaşdıqda, üstünlük azotlu gübrələrdə qalır.

Bu məlumatlar eyni zamanda soya becərilməsinin bütün sahələrində nitraginin geniş tətbiqinin zəruriliyini göstərir; bu, bioloji azotun səfərbər edilməsini asanlaşdıracaq və bahalı mineral azota qənaət edəcəkdir. Şəmkir regionunda üzvi gübrələrin soya məhsuldarlığına təsiri məsələsi 2020-2022-ci illərdə tədqiq edilmişdir.

Yevlax eksperimental sahəmizin başqa sahəsində soyada bu gübrələrin tətbiqi zamanı hər hektarda məhsuldarlıq 1,8-2,5 olmuşdur (cədvəl 3).

Aparılan təcrübələrdə peyin və quş zığından istifadə edərək yaxşı nəticələr əldə edilmişdir.

**Cədvəl 3.**

| Gübrələr | Sent/ha | % |
|---|---|---|
| Gübrəsiz | 15,5 | 100 |
| Peyin 20 t/ha | 17,7 | 112 |
| Peyin 30 t/ha | - | - |
| Quş zığı | 17,0 | 108 |

Yerli gübrələrdən: peyindən, küldən, quş tullantılarından və s.-dən maksimum istifadəyə diqqət yetirilməlidir ki, bu da mövcud məlumatlara əsasən onun becərilməsinin bütün sahələrində soya məhsuldarlığının əhəmiyyətli dərəcədə artmasına şərait yaradır (Yusifov, 2011: 145-146).

Gübrələrin tətbiqi vaxtı və normaları.

Soya üçün gübrələrin əsas tətbiqi payızda, şumlamadan əvvəl, sonradan şum dərinliyinə gübrə verilməklə aparılmalıdır. Bu müddət ərzində hər hektara 46 kq təsiredici maddə (2,6-3 kq superfosfat) nisbətində fosfat gübrələri, verilmədikdə isə 20 t/ha miqdarında yarımçürük peyin vermək lazımdır.

Payızda gübrə verilməmiş şumlanmış torpaq sahələrində gübrələr yazda, səpinqabağı becərmədən və ya şumlanmış torpaq şumlanmazdan dərhal əvvəl verilməlidir. Bu hallarda 6-8 s/ha, kül isə 5-6 s/ha nisbətində quş qığı əlavə edilir. Bu dövrdə tətbiq edilən mineral gübrələrdən ən

yaxşı nəticə hər bir təsiredici maddənin 46 kq miqdarında (2,6-3 s/ha superfosfat və 2-2,3 s/ha) fosfat və azot gübrələrinin birgə tətbiqi ilə təmin edilir. sulfat-ammonium).

Torpağın hazırlanması.

Torpağın əsas becərilməsindən səpinə qədər olan müddətdə, müəyyən ardıcıllıqla yerinə yetirilən becərmə üsullarının çəmi torpağın səpinqabağı becərilməsi adlanır. Torpağın səpinqabağı becərilməsində aşağıdakı əsas vəzifələr yerinə yetirilir:

1. Əkin qatından nəmliyin itirilməsinin qarşısının alınması, mikrobioloji proseslərin gücləndirilməsi və qida rejiminin yaxşılaşdırılması üçün hamar səthli yumşaq torpaq qatı yaratmaq,

2. Alaq bitkilərini məhv etmək və onların səpindən sonra cücərməsinin qarşısını almaq,

3. Toxumu istənilən dərinliyə basdırmaqla keyfiyyətli səpin aparmaq. Həmin vəzifələrin yerinə yetirilməsi üzləmə, kultivasiya, malalama, şaxmala çəkilməsi, tapanlama və s. tədbirləri ilə həyata keçirilir (Hüseynov, Ibrahimov, Həsənova, 2015:190-191).

Payız şumlanması. Soya becərilməsinin cənub rayonlarında qəbul edilən əkin dövriyyələrində əsas sələflər dənli taxıllardır, əsasən də payızlıqlar. Bu, torpağın hazırlanması texnikasının xarakterini və ardıcıllığını əvvəlcədən müəyyənləşdirir. Birinci torpaq becərmə taxıl biçini ilə eyni vaxtda 5-7 sm dərinlikdə şumlanma aparılmalıdır (9). Bu texnikanın vaxtında həyata keçirilməsi sonrakı şum və səpinqabağı becərmənin ən keyfiyyətli aparılmasını təmin edir, sahəni alaq otlarından və zərərvericilərdən təmizləyir və gələcəkdə məhsula qulluq işinin mexanikləşdirilməsini asanlaşdırır. Soya üçün sonrakı torpağın hazırlanması, alaq otları cücərdikdən sonar, 20-22 sm dərinlikdə payız şumundan ibarətdir.

Payız şumunun üstünlüyü həm də ondan ibarətdir ki, aparılmış tədqiqatlar göstərdiyi kimi, yazda şumlanan ərazilərdə torpağın şumlanmamış küləşlə müqayisədə daha az nəm olmasıdır (10). Bitkiçilikdə yeni üsullar və texnologiyalardan istifadə edilməsi, müəyyən zaman ərzində məhsuldarlığı artırsa da, bununla məhsulun sonsuz artımına nail olmaq mümkün deyil. İldən-ilə mineral gübrələrdən istifadə artmaqda davam edir və onlardan səmərəli istifadə müxtəlif ölkələrin iqtisadiyyatı üçün sərfəlidir (Konfrans materialları, 2023: 254).

Fermerlər çox vaxt NPK gübrələrindən kifayət qədər miqdarda istifadə etmir və ya soya istehsalı texnologiyasında ümumiyyətlə istifadə etmirlər ki, bu da çox vaxt bu növ bitkilərin məhsuldarlığının aşağı düşməsinə səbəb olur. Əsas mineral gübrələrin tətbiqi, ilk növbədə, torpaq profilinin dərinliyində fosfor və kaliumun zəif hərəkətliliyinə görə payızda planlaşdırılmalıdır. Əlbəttə ki, xüsusi iqlim şəraiti olan illərdə bu gübrələrin tətbiqini yaza sala bilərik, lakin onların tam olmaması məhsuldarlığın azalmasına səbəb olacaqdır. Gübrələrdən səmərəli və rasional istifadənin əsasını torpaq analizi, yəni münbitliyə nəzarət təşkil etməlidir ki, bu da bizə yalnız torpağın əsas elementlərlə təchizatı haqqında təsəvvür yarada bilər (12).

## Nəticə

Beləliklə, məqalədə əsas məqsəd soyanın məhsuldarlığını artırmaq, fermerlərə daha düzgü gürələrdən istifadə edərək yeni texnologiyalara diqqət etməkdir. Həmçinin soya məhsulunun becərilməsi ilə eyni zamanda istehsalında əsas göstərici zülalın yüksək olmasında rolu olan azot gübrəsinin və ya inokulyasiya prosesinin tədbiq etməkdə, bu işlərin bütün mərhələlərində onlara məsləhət vermək, kənd təsərrüfatının dirçəlməsində fermerlərə dəstək olmaqdı. İlkin olaraq torpaq analiz olumalıdır, bu da lazımi gübrələri və onların dozasını dəqiq müəyyənləşdirməyə imkan verəcəkdir.

Soya, bitkisinin köklərində yaşayan simbiyotik bakteriyalar sayəsində atmosfer azotunu mənimsəyir. Bununla birlikdə, xüsusən də azot torpaqda aşağı səviyyədə olduqda və ya yüksək azot istehlakı olan sələflərdən sonra torpaq becərildikdə ona azot əlavə etmək lazım ola bilər.

Fosfor və kalium kimi elementlərdə soyanın inkişafı üçün də vacibdir. Fosfor kök sisteminin inkişafına və meyvələrin əmələ gəlməsinə kömək edir, kalium isə vegetative orqanları gücləndirir və stresə qarşı müqaviməti artırır.

## Ədəbiyyat

1. Fedotov, V.A., Kadirov, S.V., Şedrina, D.İ., Stolarov, O.V. (2015). Rastenievodstvo. Sankt-Peterburq. Moskva: Krasnodar, 326 s.
2. file:///C:/Users/OrbitCS/Downloads/411-526-1-SM.pdf
3. Müəlliflər, 32 qabaqcıl ölkələrin təcrübəçiləri. (2014). Soya, biologiya, proizdvodstvo, ispolzovanie. Izdatelskiy dom “Zerno”, 656 s.
4. Aqrar terminlər lüğəti, (2019). Bakı: “Şərq-Qərb”, 352 s.
5. Məmmədov, Q.Y., İsmayılov, M.M. (2022). Dənli-paxlalı bitkilər. Bakı, 113 s.
6. Məmmədov, Q. (2007). Azərbaycanın torpaq ehtiyyatlarından səmərəli istifadənin sosial-iqtisadi və ekoloji əsasları. Bakı: “Elm”, 854 s.
7. Yusifov, M.A. (2011). Bitkiçilik, Bakı,“Qanun” nəşriyyatı, 382 s.
8. Hüseynov, M.M., İbrahimov, A.Q., Həsənova, A.O. (2015). Aqronomiyanın əsasları, 354 s.
9. https://glavagronom.ru/articles/osobennosti-osenney-podgotovki-pochvy-pod-sev-soi
10. https://www.rosagrochim.ru/crops/soya/agrotekhnologiya-vozdelyvaniya-soi/
11. Müasir təbiət və iqtisad elmlərinin aktual problemləri beynəlxalq elmi konfrans, IV hissə, (2023). Gəncə, 327 s.
12. https://elixir-ukraine.com/ru/primenenie-udobrenij-dlya-vyrashhivaniya-soi/

Göndərilib: 28.10.2023 Qəbul edilib: 02.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/39/82-86

**Heyran Qasımova**
Naxçıvan Dövlət Universiteti
doktorant
heyranqasimova131@gmail.com

# NAXÇIVAN MUXTAR RESPUBLİKASI ŞƏRAİTİNDƏ EV QUŞLARI HELMİNTOZLARININ TƏQİQAT ÜSULLARI

**Xülasə**

Quşçuluq əhalinin yüksək kalorili ət və yumurta məhsullarına olan tələbatının ödənilməsində, həmçinin yüngül sənayenin bəzi sahələrinin xammalla təmin edilməsində xüsusi əhəmiyyət daşıyan heyvandarlıq sahəsidir. Ancaq, bu gəlirli sahənin inkişafına mane olan, məhsuldarlığın aşağı düşməsinə səbəb olan, bəzən də quşçuluq təsərrüfatlarında kütləvi tələfatla müşayət olunan amillərdən biri helmintozlardır. Son illərdə Naxçıvan Muxtar Respublikasında fərdi təsərrüfatlarda saxlanılan quşların sayı kəskin artmışdır. Bölgədəki təsərrüfatlarda saxlanılan ev quşlarında parazitlik edən helmintlərin növ tərkibini müəyyən etmək üçün helmintoloji yarma müayinələrindən istifadə edilir. Həmçinin, təsərrüfatlardakı quşlarda helmintozların yayılma səviyyəsini, invaziyaların ekstensivliyini müəyyənləşdirmək məqsədilə helmintoovoskopik tədqiqatlar aparılır.

***Açar sözlər:*** *helmint, ev quşları, helmintoloji müayinə, koproloji müayinə, invaziyanın ekstensivliyi, intensivlik*

**Heyran Gasimova**
Nakhchivan State University
PhD student
heyranqasimova131@gmail.com

# Methods for studying helminthosis of poultry in the conditions of the Nakhchivan Autonomous Republic

**Abstract**

Poultry farming is a breeding area of special importance in meeting the population's demand for high-calorie meat and egg products, as well as in providing raw materials for some areas of light industry. However, one of the factors that hinders the development of this profitable field, causes a decrease in productivity, and is sometimes accompanied by massive losses in poultry farms, is helminthosis. In recent years, the number of poultry in individual farms of the Nakhchivan Autonomous Republic has sharply increased. Helminthological dissection examinations are used to determine the species composition of helminths parasitizing poultry kept on farms in the region. In years favorable for helminths (rainy, warm weather), outbreaks of dangerous helminthiases in a large number of young animals cause a significant loss of poultry. Also, helmintoovoscopic studies are conducted in order to determine the prevalence of helminthosis and the extent of infestation in poultry.

***Keywords:*** *helminths, poultry, helminthological examination, coprological examination, degree of infestation, intensity*

## Giriş

Naxçıvan Muxtar Respublikasının iqtisadiyyatının əsas sahələrindən biri olan kənd təsərrüfatında aqrar islahatların aparılması nəticəsində yeni təsərrüfat formaları yaradılmışdır ki, bu da heyvandarlığın, o cümlədən quşçuluğun inkişafına öz müsbət təsirini göstərmişdir. Belə ki, fərdi və özəl təsərrüfatlarda saxlanılan quşların baş sayı çoxaldılmış, onlardan alınan məhsulların

miqdarı əvvəlki illərlə müqayisədə sürətlə artmağa başlamışdır. Bu da insanların ərzaq ehtiyaclarının ödənilməsində mühüm addımlardan biri hesab olunur.

Quşçuluğun inkişaf etdirilməsi əhalini zəruri qida məhsulları olan quş əti və yumurta ilə təminatında müstəsna rol oynayır. Quşların tez yetişkənliyi, sərf olunan xərclərin qısa müddətdə götürülməsi, iqtisadi cəhətdən çox sərfəli olması, yüksək məhsul götürmək imkanının olması, əldə olunan məhsulun uzun müddət saxlanılmasının mümkünlüyü son dövrlər bu sahənin sürətlə inkişaf etdirilməsinə səbəb olmuşdur.

Əhalinin yüksək kalorili ət və yumurta məhsullarına olan tələbatının ödənilməsində, həmçinin yüngül sənayenin bəzi sahələrinin xammalla təmin edilməsində quşçuluq əvəzsiz rol oynayır. Ancaq, bu gəlirli sahənin inkişafına mane olan, məhsuldarlığın aşağı düşməsinə səbəb olan, bəzən də quşçuluq təsərrüfatlarında kütləvi tələfatla müşayiət olunan amillərdən biri helmintozlardır. İnvazion xəstəliklərə qarşı mübarizədə mühüm nailiyyətlərə baxmayaraq, bir çox helmintozlar quşçuluq təsərrüfatlarına ciddi zərər vurmaqdadır.

Muxtar respublikanın təbii-iqlim şəraiti ev quşlarının sayını artırmağa və onlardan daha çox məhsul almağa imkan verir. Bununla yanaşı invazion xəstəlik törədicilərinin bioloji xüsusiyyətlərinin öyrənilməsi, onlara qarşı mübarizə tədbirlərinin işlənib hazırlanması və tətbiq edilməsi əsas məsələlərdən biridir.

Helmintəleyhi tədbirlərin səmərəliliyinin yüksəldilməsi, ev quşlarının helmintozlarının aradan qaldırılması üçün daha mütərəqqi mübarizə üsul və vasitələrinin işlənib hazırlanması hal-hazırda xüsusi əhəmiyyət daşıyan məsələlərdəndir.

Təcrübə göstərir ki, şəxsi quşçuluq təsərrüfatlarında fərdi dehelmintizasiyalar daha yüksək antihelmint səmərə verir. Lakin, böyük quşçuluq təsərrüfatlarında, broylerlərdə intensiv texnologiyaya cavab verən, baytar işçisinin əməyini yüngülləşdirmək, sürətlə yerinə yetirmək, qısa zamanda çoxsaylı quşlarda helmintəleyhi tədbir aparmaq məqsədilə qrup halında dehelmintizasiyaların aparılması mühüm əhəmiyyət kəsb edir (Məmmədov, 2009:106-108; Məmmədov, 2017: 39-42; Waller, 1999: 497-508).

Müxtəlif yem və dərman bitkilərinin əldə edilməsinin ucuz və əlverişli olması, eyni zamanda toksiki təsirinin olmaması, quşçuluq təsərrüfatlarında müxtəlif helmintozlara qarşı antihelmint vasitə kimi işlədilməsinə imkan verir. Ona görə də bu istiqamətdə tədqiqat işləri apararaq, antihelmint vasitələrin işlənib hazırlanması və təsərrüfatlarda ev quşlarının qarışıq helmintozlarının müalicə və profilaktikasında tətbiq edilməsi aktullığı ilə seçilən məsələlərdəndir.

**Eksperimental hissə**. Helmintozların törədiciləri olan müxtəlif helmintlər öz biomorfoloji quruluşlarına və inkişaf xüsusiyyətlərinə görə bir-birlərindən fərqlənirlər. Müəyyən edilmişdir ki, quşlarda parazitlik edən helmintlər *Cestoda* (lentşəkilli qurdlar), *Trematoda* (sorucu qurdlar), *Nematoda* (yumru qurdlar) və *Acanthocephala* (tikanbaşlı) sinflərinə aid olmaqla müxtəlif bioinkişaf xüsusiyyətlərinə malikdirlər.

Helmintlər quşların müxtəlif orqanlarında və hüceyrələrində parazitlik edirlər. Bir çox helmintlər lokalizasiya yerlərindən asılı olaraq quşların mədə-bağırsaqlarında, qara və ağ ciyərlərində, nəfəs borularında və qan damarlarında yaşamaqla parazit həyatı sürürlər. Helmint növlərinin böyük əksəriyyəti quşların müxtəlif orqanlarında: məsələn, rayetinalar, askaridlər və kapillyarilər nazik bağırsaqda, heterakislər kor bağırsaqda, sinqamuslar isə yuxarı tənəffüs yollarında yaşayaraq parazitlik edirlər.

Helmintlər çox sürətlə törəyib artırlar. Belə ki, bir helmint 24 saat müddətində on minlərlə yumurta qoyur. Yastı qurdların isə hər buğumunda minlərlə yumurta olur ki, onlar da gün ərzində son hermafrodit buğumlarını xarici mühitə tökürlər (Agayeva, 2014: 170-172; Dubinina, 1971: 74; Mamedov, 2010: 445-446).

Helmint yumurtaları xarici mühitdə inkişaf mərhələlərinə görə iki hissəyə ayrılırlar. Belə ki, bir çox helmintlər (Geohelmintlər) xarici mühitdə əlverişli şərait olduqda yumurtalarda torpaqda, aralıq sahibsiz inkişaf edib yayılırlar. Digər növ helmintlərin (Biohelmintlər) yumurtaları və sürfələri əlverişli şərait olduqda aralıq sahiblərinin, müxtəlif onurğasızların iştirakı ilə inkişaf edərək quşları yoluxdurma mərhələsinə çatırlar. Quşlar belə invazion sürfə və yumurtaları yem və

su ilə udduqda, yumurtalar onların orqanizmində yetkin helmint olana qədər inkişaf edir və cinsi yetişkən mərhələyə çatırlar. Helmintin cinsi yetişkənliyə, yəni imaginal mərhələyə çatdığı orqanizm-əsas sahib adlanır. Helmintin sürfə mərhlələrinin inkişaf etdiyi orqanizm isə əlavə sahib adlanır (Nəsirov, Qazıyev, Bünyadova, 2010: 201-207; Akbayev, Zotov, 1996: 15-18).

Helmintozlara qarşı müalicə və profilaktiki tədbirləri aparmadan öncə ev quşlarında parazitlik edən helmint növlərini müəyyən etmək gərəkdir.

Bölgədəki təsərrüfatlarda saxlanılan ev quşlarında parazitlik edən helmintlərin növ tərkibini müəyyən etmək üçün helmintoloji yarma müayinələrindən istifadə edilir. Həmçinin, təsərrüfatlardakı quşlarda helmintozların yayılma səviyyəsini, invaziyaların ekstensivliyini müəyyənləşdirmək məqsədilə helmintoovoskopik tədqiqatlar aparılır.

K.İ.Skryabinin helmintoloji yarma metodu ilə quşların daxili orqanları – mədə-bağırsaqları, yumurtalıq, tənəffüs orqanları müayinə edilərək, həmin orqanlarda parazitlik edən helmintlər aşkar edilir. Toplanılmış helmintlərin növ tərkibi araşdırılmış və xüsusi helmint təyinedicilərinə əsasən dəqiqləşdirilir (Məmmədov, 2004: 232-236; Məmmədov, 2007: 157-160; Zharov, İvanov, Strelnikov, 1982: 130)

Yarma müayinələri aparılan zaman və helmintoloji materialın toplanılmasında quşların saxlanılma şəraiti, yemləndirilməsi, suvarılması, yetişdirilmə texnologiyası, nəzərə alınır. Şəxsi təsərrüfatlarda toyuq, hind toyuğu, ördək qazların kütləvi kəsimi əsasən payızın sonları, qışın əvvəlinə təsadüf etdiyindən, həmin vaxtlarda müntəzəm olaraq təsərrüfatlara gedib, əvvəlcədən kəsimin vaxtlarını müəyyənləşdirilir. Toplanılmış helmint nümunələri 3%-li formalin məhlulunda konservləşdirilir.

Quşlardan toplanılmış kal nümunələri Fülleborn, Darlinq və ardıcıl yuma üsulları ilə helmintoovoskopik və helmintolyarvoskopik müayinlərdən keçirilərək, təsərrüfatlarda helmint invaziyalarının yayılma səviyyəsi, ekstensivliyi müəyyən edilir (Məmmədov, 2009: 106-108; Musayev, Hacıyev,Yolçuyev, Vahidova, Mustafayeva, 1991: 160).

Fülleborn üsulu ilə aparılmış koproloji müayinələrdə quşlardan götürülmüş kal nümunələri 50 ml-lik stəkanlara qoyularaq, üzərinə tədricən flotasiya məhlulu-doymuş duz məhlulu əlavə edilir, yaxşı qarışdırılaraq, tənzifdən digər stəkana süzülür. 20-30 dəqiqə gözlənildikdən sonra metal ilgəklə məhlulun üst təbəqəsindən müxtəlif yerlərdən 2-3 damla götürülərək cisim şüşəsinin üzərinə qoyulur və mikroskop altında müayinə edilir. (Məmmədov, Hacıyev, Şirinov, Ağayev, 1986: 304-356).

Darlinq üsulu ilə aparılan helmintoovoskopik müayinələrdə quşlardan götürülmüş kal nümunəsi 50 ml-lik stəkanlara qoyularaq üzərinə su əlavə edilir və qarışdırılaraq sentrafuqanın sınaq şüşəsinə süzülür. Bir dəqiqə müddətində sentrifuqadan keçirildikdən sonra cisim şüşəsinin dibindəki çöküntü saxlanılmaqla üzərindəki su atılır və çöküntünün üzərinə doymuş duz məhlulu, qliserin qarışığı əlavə edilərək, yenidən 1 dəqiqə müddətində sentrafuqadan keçirilir. Sonra nazik məftil ilgəklə sınaq şüşəsindəki məhlulun səthindən 1-2 damla götürülərək, cisim şüşəsinin üzərinə qoyulur və mikroskop altında baxılır (Musayev, Hacıyev, Yolçuyev, Vahidova, Mustafayeva, 1991: 160; Nəsirov, Qazıyev, Bünyadova, 2010: 201-207).

Ardıcıl yuma üsulu ilə aparılan koproloji müayinələrdə 100 ml-lik stəkanlara quşların kalı qoyulur və üzərinə azacıq su əlavə edilərək qarışdırılır. Qarışığın üzərinə 10-15 ml su əlavə edilərək çalxalanılır və təzifdən digər stəkana süzülərək stəkan dolana qədər su əlavə edilir. Məhlul 5 dəqiqə çökdürüldükdən sonra üzərindəki su atılır və yenidən stəkan su ilə doldurulur. Bu proses maye şəffalaşana qədər 4 dəfə təkrar edilir. Sonra stəkandakı maye ehtiyatla tökülür, çöküntü hissə-hissə cisim şüşəsinin üzərinə qoyularaq mikroskop altında müayinə edilir (Musayev, Hacıyev,Yolçuyev, Vahidova, Mustafayeva, 1991: 160; Məmmədov, 2017: 39-42).

Əgər tədqiqatlar aparılmış təsərrüfatlarda hər hansı helmintəleyhi tədbir aparılmışdırsa, bu zaman helmintoovoskopik müayinələrin gedişində yanaşı olaraq, tətbiq edilmiş preparatların antihelmint təsiri öyrənilir. Quşların bir qram kal nümunəsində onlarda parazitlik edən helmintlərin yumurtalarının sayı xüsusi sayma kameralarından istifadə edilməklə müəyyələşdirilir. Alınmış nəticələrə əsasən təcrübələrin əvvəlində və sonunda helmint yumurtalarının sayı statistik cəhətdən

hesablanaraq invaziyanın ekstenseffektliyi (EE,%) müəyyən edilir (Nəsirov, Qazıyev, Bünyadova, 2010: 201-207; Dubinina, 1971: 74).

Helmintoloji müayinələrin nəticələri də statistik cəhətdən işlənərək, invaziyanın ekstensivlik faizi (Eİ, %) və bağırsaqlarda askar edilən helmint sayına görə invaziyanın intensivliyi (İİ, helmint sayı/quş) müəyyənləşdirilir.

Quşların helmintozlarına qarşı mübarizədə müxtəlif kimyəvi, antihelmint təsirli dərman maddəllərindən istifadə edilir. Farmokoloji xüsusiyyətlərinə görə bu dərman vasitələri quş orqanizmində parazitlik edən helmintlərin müxtəlif orqan və toxumalarında müxtəlif degenerativ, distrofik dəyişikliklər əmələ gətirməklə onları məhv edir.

Aparılan tədqiqatlara görə antihelmint təsirli preparat və bu xassəli dərman bitkiləri helmintlərə təsir mexanizminə görə bir neçə qrupa ayrılır:

a) Helmint hüceyrələrinə toksiki təsir göstərən preparatlar (hüceyrə zəhərləri)
b) Helmintlərin sinir-əzələ tənzimlənməsi proseslərini pozan maddələr
c) Helmintlərin sinir-əzələ sistemində distrofik dəyişikliklər əmələ gətirməklə örtük toxumasını (kutikula) zədələyən dərman preparatları
d) Helmintlərin mübadilə proseslərini pozan maddələr
e) Helmint toxumasının həll olmasına səbəb olan proteolitik fermentlər

Quş orqanizmində parazitlik edən helmintlərin morfologiyasında, biologiyasında, lokalizasiyasında olan müxtəlifləri nəzərə almaqla belə müxtəlif təsir xüsusiyyətlərinə malik olan dərman maddələri hazırlanmışdır.

Ancaq bu tip kimyəvi dərman maddələrinə kifayət qədər maddi vəsait ödənilməsinə baxmayaraq, bəzən quş orqanizmində toksiki dəyişikliklərə səbəb olurlar. Xüsusilə də cücələrdə kütləvi zəhərlənmələrə səbəb olurlar. Bu baxımdan yeni antihelmint maddələr tətbiq edildikdə, onun parazitə spesifik təsirinə və sahibin orqanizmində isə mümkün qədər zəif dəyişikliklər əmələ gətirməsinə nail olmaq çox vacibdir. Ona görə də hazırda quşların helmintozlarına qarşı kimyəvi preparatlarla yanaşı antihelmint təsirli bitkilər də tətbiq olunur.

Əczaçılıq praktikasında qəbul edilmiş qaydalara əsasən bu bitkilərin ot unu və dəmləmələri hazırlanır. Bitkilərdən hazırlanmış preparatların helmintlərə təsiri həm *in vitro*, həm də *in vivo* şəraitdə öyrənilir. Təcrübələrin *in vitro* şəraitində aparılması üçün bitkilərin üyüdülmüş kütlələri şüşə stəkanlara qoyularaq üzərinə 1:10 nisbətində qaynar su əlavə edilir və 30 dəqiqə müddətində su hamamında saxlanılaraq dəmləmə hazırlanır.

Hazırlanmış dəmləmələr *in vitro* şəraitdə helmintlərə tətbiq edilərək, bir neçə seriyada təcrübələr aparılır. Kəsilmiş quşların bağısaqlarından, əzələvi mədəsindən götürülmüş helmintlər icərisində $40^0$C temperaturda bitki ekstraktları olan Petri fincanlarına keçirilir (hər fincana 10-15 helmint). Sonra həmin fincanlar termostada qoyularaq və $42\text{-}43^0$C temperaturda saxlanılır, helmintlərin hərəkətlərinin zəifləməyə başladığı zamandan tam məhv olduqları vaxta qədərki müddət qeyd edilir. Hər bir bitki ekstratının təsiri öyrənildiyi zaman, anoloji olaraq həmin növdən olan helmintlər içərisində fizioloji məhlul olan fincanlara qoyularaq termostadda nəzarət qrupu kimi saxlanılır.

Dərman bitkilərinin antihelmint təsirini *in vivo* şəraitində öyrənmək üçün əvvəlcədən təsərrüfatlar müəyyənləşdirilir və həmin təsərrüfatlarada quşlar seçilərək işarələnir və hər birindən ayrılıqda kal nümunələri götürülərək, koproloji müayinələrdəndən keçilir. Müayinələrin nəticəsində helmintlərlə təbii yoluxmuş quşlar aşkar edilir. Həmin quşlar qruplara ayrılaraq, əvvəlcədən aclıq dietası saxlanılmaqla dərman bitkilərinin ot unları 2 gün müddətində, hər bir baş quşa 5q olmaqla yem normasının azaldılmış miqdarı ilə qarışdırılaraq onlara yedizdirilir. Hər bir qrupda təbii yoluxmuş quşlardan anoloji təcrübə qrupları da yaradılaraq nəzarət qrupu kimi saxlanılır. Təcrübənin 5-ci günündən başlayaraq quşlardan kal nümunələri götürülür və koproloji müayinələr aparılır. Helmintlərlə təbii yoluxmuş quşlara daha güclü antihelmint təsir göstərən dərman bitkiləri müəyyən edilir.

## Nəticə

Helmintozlara qarşı mübarizə tədbirləri içərisində dehelmintizasiyalar xüsusi əhəmiyyətə malikdir. Ona görə də quş orqanizmində parazitlik edən helmintlərin morfologiya, biologiya və lokalizasiyasından asılı olaraq müxtəlif təsir xüsusiyytələrinə malik olan dərman maddələri tətbiq olunur. Ancaq, helmintozlara qarşı müalicə və profilkatiki tədbirləri aparmadan əvvəl ev quşlarında parazitlik edən helmint növləri müəyyən etməlidir ki, tətbiq ediləcək dərman preparatlarının və ya antihelmint təsirli dərman bitkilərinin təsiri daha səmərəli olsun və sahib orqanizmində patoloji dəyişikliklərə səbəb olmasın. Bunları nəzərə alaraq, tədqiqatlar aparılan təsərrüfatlardakı quşların helmintlərlərlə yoluxma səviyyəsini müəyyən etmək üçün helmintoloji müayinələrdən istifadə edilir. Quşlardan götürülmüş kal nümunələri helmintoovoskopik, daxili orqanlarda aparılmış yarma müayinələrinə əsasən helmintoloji araşdırmalardan istifadə edilir. Nəticədə invaziyanın ekstensivliyi və intensivliyi müəyyənləşdirilir.

## Ədəbiyyat

1. Məmmədov, E.N. (2009). Helmintozlarla mübarizənin ümumi prinsiplərinin tədrisinə dair. Naxçıvan Müəllimlər İnstitutunun Xəbərləri, № 3(19), 106-108 s.
2. Məmmədov, E.N. (2017). Helmintozlarda patogenezin xüsusiyyətləri. Gəncə Regional Elm Mərkəzinin xəbərlər məcmuəsi. № 2 (68), 39-42 s.
3. Waller, P.J. (1999). Anthelmintic resistance. International Journal for Parasitology, 32, pp.497-508.
4. Agayeva, Z.T. (2014). Smeshannyye invazii gusey v Azerbaydzhane. Vestnik Sum'skogo Natsional. Agrar. Universiteta. Sum'sk, Vyp., 1 (34), s.170-172.
5. Dubinina, M.N.(1971). Parazitologicheskoye issledovaniye ptits. Leningrad, 74 s.
6. Mamedov, E.N. (2010). Gel'mintologicheskaya otsenka predgornykh pastbishch Nakhchyvanskoy Avtonomnoy Respubliki. Sb. nauchnykh trudov po materialam konferentsii «Pervyye Mezhdunarodnyye Bekkerovskiye chteniya», Volgograd, ch.1, s.445-446.
7. Nəsirov, Ə.M., Qazıyev, N.Ş., Bünyadova, K.İ. (2010). Ev quşlarının helmint faunasının ekoloji-faunistik təhlili. Azərbaycan Zooloqlar Cəmiyyətinin əsərləri, II cild. Bakı, s.201-207.
8. Akbayev, M.Sh., Zotov, G. (1996). Epizootologicheskaya situatsiya po smeshannym invaziyam domashnikh ptits tsentral'noy chasti RF. Vestnik s/kh nauki. Moskva, Vyp. 1, s.15-18.
9. Məmmədov, E.N. (2004). Naxçıvan Muxtar respublikasında helmintoloji tədqiqatlar. Naxçıvanın tarixi, mənəvi mədəniyyətinin təbii sərvətlərinin öyrənilməsi. Elmi konfransın materialları. Bakı, s.232-236.
10. Məmmədov, E.N. (2007). Helmintozların epizootik proseslərinin bəzi xüsusiyyətləri. AMEA Naxçıvan Bölməsi, Xəbərlər. Təbiət elmləri seriyası. № 2, s.157-160.
11. Zharov, A.V., Ivanov, I.V., Strel'nikov, A.P. (1982). Vskrytiye patologicheskaya diagnostika bolezney selskokhozyaystvennykh zhivotnykh. Uch. posobiye dlya VUZov. Moskva, 130 s.
12. Məmmədov, A.Q., Hacıyev, Y.H., Şirinov, N.M., Ağayev, Ə.Ə. (1986). Baytarlıq parazitologiyası. Bakı, s.304-356.
13. Musayev, M.Ə., Hacıyev, A.T., Yolçuyev, Y.Y., Vahidova, S.M., Mustafayeva, Z.Ə. (1991). Azərbaycanda ev quşlarının parazitləri və onlara qarşı mübarizənin elmi əsasları. Bakı: Elm, 160 s.

Göndərilib: 07.11.2023 Qəbul edilib: 05.12.2023

DOI: https://doi.org/10.36719/2707-1146/39/87-92

**Fərid Mirzəyev**
Azərbaycan Dövlət Aqrar Universiteti
magistrant
ferid.genceli.2001@gmail.com

# PESTİSİDLƏRİN SU MÜHİTİNƏ TƏSİRİ

**Xülasə**

Məhsuldarlığın artırılması üçün pestisidlərdən və mineral gübrələrdən geniş istifadə olunur. Pestisidlərdən istifadənin müasir dövrümüzdə müsbət cəhətləri ilə yanaşı mənfi cəhətləridə var. Onlardan ən geniş yayılanı pestisidlərin və onların transformasiya məhsullarının su mühitinə təsiridir. Su mühitinin canlıları olan fito- və zooplanktonlar, molyuskalar, balıqlar, amfibiyalar və s. kimi digər canlılara pestisidlər birbaşa və dolayı, zərərli və ölümcül təsir edir. Pestisidlər az miqdar konsentrasiyada suyun orqanoleptiki xassəsini (iy, dad, rəng, bulanıqlıq) dəyişdirə bilər və eyni zamanda bu təsir su canlılarının da həyat şəraitinə təsir edir. Xlor-üzvi tərkibli pestisidlərdin su hövzələrinə kəskin təsiri qaçınılmazdır. Herbisidlər su heyvanlarına güclü təsir göstərir. Herbisidlər su canlılarının orqanlarında və toxumalarında toplanır.

***Açar sözlər:*** *pestisid, herbisid, su, mühit, hövzə*

**Farid Mirzayev**
Azerbaijan State Agrarian University
master student
ferid.genceli.2001@gmail.com

## Effect of pesticides on the aquatic environment

**Abstract**

Pesticides and mineral fertilizers are widely used to increase productivity. The use of pesticides in our modern times has its pros as well as its cons. The most widespread of them is the effect of pesticides and their transformation products on the aquatic environment. Phyto- and zooplanktons, molluscs, fish, amphibians, etc., which are aquatic creatures. Pesticides have direct and indirect, harmful and fatal effects on other living things. Pesticides can change the organoleptic properties of water (smell, taste, color, turbidity) in small concentrations, and at the same time this effect affects the living conditions of aquatic organisms. The acute impact of organochlorine pesticides on water bodies is inevitable. Herbicides have a strong effect on aquatic animals. Herbicides accumulate in the organs and tissues of aquatic organisms.

***Keywords:*** *pesticide, herbicide, water, environment, basin*

## Giriş

1940-cı illərdən əvvəl pestisidlər ağır metallardan – arsen, mis, qurğuşun və civədən əldə edilirdi. Bu kimyəvi maddələr suda qismən həll olunurdu və buna görə də onların qidalarda olan qalıqları çox olduğundan daha çox narahatlıq doğururdu. İkinci Dünya Müharibəsi zamanı təqdim edilən xlorlu karbohidrogenlər kimi sintetik üzvi pestisidlər yeraltı suları nadir hallarda çirkləndirməsinə baxmayaraq qida zəncirində zəhərli konsentrasiyalarda toplanması narahat doğururdu. Xlorlu karbohidrogenlərin bəzi nümunələri DDT, aldrin, endrin və xlordandır ki, onlar suda nisbətən həll olunmur, lakin kimyəvi cəhətdən torpaq hissəciklərinə daha çox bağlıdırlar. Diazinon və malathion kimi orqanofosfor birləşmələri xlorlu karbohidrogen pestisidlərini əvəz etmək üçün hazırlanmış sintetik üzvi pestisidlərdir. Fosfor tərkibli üzvi pestisidlər hələ də insanlar üçün yüksək toksikidir, lakin onların ətraf mühitdə sürətlə parçalanma qabiliyyəti yeraltı sularda toplanmasını azaldır. Xlorlu karbohidrogenləri əvəz etmək üçün karbamat pestisidləri də tətbiq

edilir. Karbamat pestisidlərinin aktiv maddələri torpaq hissəciklərində adsorbsiya olunmur, buna görə də bu birləşmələr səth sularına daxil ola bilər (Trautmann, Porter, Wagenet, 1985).

Pestisidlərin ətraf mühitə düşməsində su əsas nəqliyyat vasitəsidir. Açıq su hövzələrinə, pestisid istehsal edən müəssisənin axıntı suları vasitəsilə, kənd təsərrüfatı otlaqlarını və meşələrin təyyarə və ya əl ilə çiləmə, yaxud tozlama apararkən, yağış və qar suları ilə, həm də açıq su hövzələrində su yosunlarını, molyuskaları, insan və heyvan üçün xəstəlik törədiciləri, alaq otlarını məhv etməkdən ötrü pestisidlə işlədikdə zəhər düşə bilər (Babayev, 1992).

Torpaq və qrunt suları daxili su hövzələri, çaylar və dünya okeanları müəyyən şəraitdə pestisidlərin deposu (yeri) ola bilər. Bunun nəticəsində su hövzələrnin ilk növbədə davamlı pestisidlərlə çirklənməsi baş veir. Dünyanın bir çox ölkələrində açıq su hövzələrində xlor-üzvi pestisidlərdən DDT, lindan, HXCH, toksafen qalığı müşahidə edilmiş, çox cüzi hallarda təhlükə yaradan konsentrasiya yol verilən qatılıq həddini (YVQH) aşması aşkarlanmışdır (Babayev, 1992).

1966-1968-ci illərdə ABŞ-da aparılmış xüsusi tədqiqatın nəticəsi göstərmişdir ki, tədqiqat aparılmış çayların 41%-də pestisidlərin konsentrasiyası 1 l-də 0,001 mq və 8% nümunədə isə 0,012 mq/l hüduda çatmışdır (Babayev, 1992). Davamlı xlor-üzvi insektisidlərin toplanmasında su hövzələrinin lili vacib əhəmiyyətə malikdir. Bu suyun ikinci çirklənməsinə onu bulandırdıqda səbəb ola bilər (Babayev, 1992). Bir neçə pestisidlər az miqdar konsentrasiyada suyun orqanoleptiki xassəsini (iy, dad, rəng, bulanıqlıq) dəyişdirə bilər, fitoplanktonların fotosintez prosesinə, suda yaşayan ekosistemin həyat fəaliyyətinə mənfi təsir göstərir və eyni zamanda qida zənciri vasitəsilə keçərək məhsullarda toplanır (Babayev, 1992).

Pestisidlərin suda həll olmayıb toplanmasının birbaşa (kəskin, yaxud xroniki toksikilik) və dolayı (suda həll olunan karbon qazının tərkibinin azalması, suyun kimyəvi xassələrinin dəyişkənliyi, su həşəratlarının məhvi və s.) təsiri ola bilər (Babayev, 1992).

Sudan başqa bioloji zəncir birliyə pestisid keçdiyi zaman onların saxlanma davamlılığı yüz və min dəfələrlə artır. Orqanizmə pestisidlər süzgəclə keçdikdə (məsələn, plankton orqanizmlərin hər hansı növlərindən biri), davamlı kimyəvi zəhərlə toxumalarda yığılıb sonra balığın orqanizminə keçə bilər. Sonrakı birləşmədə qida zəncirindən keçən pestisidlərin toksikiliyi bir neçə dəfə çoxalır. Belə ki, xlor-üzvi birləşmələrdən olan preparatlar yağış suyu ilə axıb su hövzəsinə 0,00003 mq/l töküldükdə onlar balıqda 1,0-7,4 mq/kq, xərçəngdə isə 0,5-0,7 mq/kq rast gəlinir. Bunlardan xüsusilə polixlorkamfenin (toksafen) sudakı qida zəncirində kumulyasiya xüsusiyyəti böyükdür. Toksafen, göldə 0,0002-0,0006 mq/l konsentrasiyada aşkarlanmışdır: bu su bitkilərində 0,2-0,4 mq/kq; suda yaşayan orqanizmlərdə 0,5-1,4 mq/kq; foreldə 3,5-5,7 mq/kq; lasosda 1,8-3,4 mq/kq olur. Toksafenin təsirinin zəifləməsi çox ləng gedir, belə ki, onun zəhərliliyi 6 il ərzində su hövzələrində xeyli azalmışdır (Babayev, 1992).

Qeyd etmək lazımdır ki, pestisidlərin toksikiliyi hər bir növ balıq və başqa suda yaşayan canlılar üçün müxtəlifdir. Bu fərq çox geniş amplitutada özünü göstərir. Həmin zəhərli pestisidlərin ən təhlükəlisi xlor-üzvi birləşmələrdən olan pestisidlərdir, az təhlükəlisi isə fosfor-üzvi birləşmələrin və karbaminli turşuların törəmələridir. Ancaq bəzi birləşmə sinfində balıq üçün toksikiliyin dəyişməsi olduqca əhəmiyyətlidir. Bu da bəzi preparatların balığa təsir mexanizması ilə əlaqədardır (Babayev, 1992). Herbisidlərin suda hərəkəti xüsusilə diqqətəlayiqdir. Axarı olmayan göllərə, həm ali su bitkilərinin, həm də ibtidai yosunların (fitoplankton və fitobentos) inkişafını dayandırmaq məqsədilə verilən herbisidlərdir. Müəyyən edilmişdir ki, təsiredici maddənin suda həll olması və onun su gölündə diffuziyası ilə herbisidlər bütün başqa su ekosisteminin komponentlərinə təsir göstərir: mikroorqanizmlərə, bakteriya fito- və zooplanktona fito- və zoobentosa, neystona, balığa və amfibiyə. Bu həm də su hövzəsinin hidrokimyəvi rejiminə də (oksigen, karbon turşularına, Ph, karbonat müvazinətinə, müxtəlif azot formalarının dinamikasına, üzvi komponentlərə) təsir edir (Babayev, 1992). Su hövzəsində mikrofloralarının reaksiyasında herbisidlərin təsirinə ən çox saprofit mikroorqanizmlərin miqdarının artması aydın görünür (dərmanlamadan 2-3 həftə sonra). Bir neçə herbisidlər (diuron, monuron) siteril təsir göstərir. Ammonifikatorların miqdarı və funksional fəaliyyəti dəyişilir, bu da su hövzəsində ammonyak və nitratların toplanmasına gətirib çıxarır (Babayev. 1992). Herbisidlər ən güclü təsiri su heyvanlarına göstərir. Herbisidlər

hidrobiontların orqanlarında və toxumalarında toplanır. Zooplanktonun komponentlərindən budaqlanmış bığlı xərçənglər herbisidlərə çox həssasdır. Onların 3-5 nəsli məhv olur. Su heyvanlarının məhv olması oksigenin çatışmazlığından - yəni bitki tələf olduqda oksigen əmələ gəlməsinin dayanmasından, yaxud fitoplanktonun parçalanmasından, bitkinin fitosintetik fəaliyyətinin zəifləməsi nəticəsində və oksigenin yaranmasından ola bilər. Uzun müddət və kəskin oksigen azlığının yaranması balıq, amfibiya və onurğasızların məhvinə səbəb olur. Metamorfozun pozulması yüngül su həşəratlarında (xironomid) qeyd olunmuşdur. Balıq və onurğasızların embrional və sürfə mərhələsi inkişafı, xüsusilə herbisidlərin təsirinə həssasdır (Babayev, 1992).

Herbisidlərin təsirindən su hövzəsində azot, karbon və oksigenin dövranı pozulur. Lakin birlikdə su hövzələrinin ekosistemləri, bir dəfə herbisisdlərlə dərmanlandıqda herbisidin doza, preparativ formasından, bitki tərkibinin növündən, biokütlədən, parçalanmaya uğramasından, su axınının sürətindən, qrunt suyunun fiziki-kimyəvi xüsusiyyətindən və s. asılı olaraq çox tez (bir həftə, yaxud 1 aydan sonra) bərpa olur. Herbisidlərin müxtəlif preparativ formalarının müqayisəli qiymətləndirilməsi nəticəsində (həll olan toz, suspenziya, emulsiya, dənəvərləşdirilmiş preparatlar) onların su ekosisteminə təsirinin müxtəlif dərəcəsi göstərilmişdir. Dənəvərləşdirilmiş herbisid forması ilə qurudulmuş, yaxud buraxılmış göllərin dibi, yaxud lokal dənəvərin yazda alaqların çox erkən inkişaf mərhələsində verilməsi (15-16 $^{o}$C) ətraf mühit üçün təhlükəsizdir. Ümumiyyətlə, pestisidlərin çoxu sulu mühitdə tez parçalanır, ona görə də onların kənd təsərrüfatı bitkilərində olan ziyanvericilərə, xəstəliklərə və alaq otlarına qarşı mübarizədə istifadə etdikdə başqa orqanizmlər üçün mənfi təsir olmur (Babayev, 1992).

***Səth suyunun çirklənməsi.*** Pestisidlər bitkilərin yarpaq və gövdəsindən yuyularaq və torpaqdan axın vasitəsilə səth sularına qədər gəlib çata bilər. Suyun pestisidlərlə çirklənməsi geniş yayılmışdır. ABŞ Geoloji Xidməti (USGS) tərəfindən 90-cı illərin əvvəlindən ortalarına qədər ölkənin əsas çay hövzələrində aparılmış hərtərəfli tədqiqatların nəticələri təəccüb verici göstəriciləri aşkarlamağa imkan verdi. Bütün axınlardan alınan su və balıq nümunələrinin 90 %-dən çoxunda bir neçə pestisid növünə rast gəlinmişdir (Kole, Banerjee, Bhattacharyya. 2001). Kənd təsərrüfatında və şəhərlərdə istifadə olunan pestisidlərin birgə təsiri əsas çaylardan götürülmüş nümunələrdə və şəhər axınlarının nümunələrinin 99 %-də rast gəlinmişdir (Bortleson, Davis. 1987–1995). Puget Sound hövzəsində 17-i herbisid olmaqla 23 pestisid aşkar edilmişdir. ABŞ Geoloji Xidmətinə (USGS) görə, şəhər axınlarında ən çox kənd təsərrüfatında istifadə olunan pestisidlər aşkar edilmişdir (US Department of the Interior. 1995). 2,4-D, diuron və prometon herbisidləri, həmçinin şəhər sakinləri və məktəblər tərəfindən istifadə edilən insektisidlər – xlorpirifos və diazinon ölkə üzrə səth və qrunt sularında ən çox aşkar edilən 21 pestisiddən biri idi (U.S. Geological Survey. 1998). ABŞ Geoloji Xidməti (USGS) həmçinin müəyyən etdi ki, şəhər axınlarında insektisidlərin konsentrasiyası əsasən suda yaşayan canlılara təsirin YVQH-i üstələyir (U.S. Geological Survey. 1999). ABŞ Geoloji Xidmətinə (USGS) görə, "ümumiyyətlə şəhər axınlarında ən çox kənd təsərrüfatı axınlarından olan pestisidlər aşkar edilmişdir" (Bortleson, Davis. 1987–1995). Herbisid 2,4-D ən çox rast gəlinən pestisid olub, 13 axından 12-də aşkar edilmişdir. Puget Sound hövzə axınlarında da diazinon insektisidləri və alaq otlarını öldürən diklobenil, diuron, triklopir və qlifosat aşkar edilmişdir. Həm diazinon, həm də diuron ABŞ Milli Elmlər Akademiyası tərəfindən suda yaşayan canlıların mühafizəsi üçün tövsiyə edilən konsentrasiyaları aşan səviyyələrdə aşkar edilmişdir (Bortleson, Davis, 1987–1995).

***Yeraltı suların çirklənməsi.*** Pestisidlərin gələcəyini və miqrasiyasının öyrənilməsi onların biosferdə dövriyyəsini bilmək üçün vacibdir. Pestisidlər tətbiq edildikdən sonra müxtəlif talelərlə qarşılaşır və ətraf mühitdə onların taleyinin ümumi mənzərəsini göstərirdi. Bitkilər tərəfindən sorulmayan pestisid ya torpaqda qalacaq, ya da digər kimyəvi formalara parçalanacaq. Həll olan pestisidlər, xüsusilə yağışlar zamanı su molekulları tərəfindən daşınaraq torpaq təbəqələrindən aşağıya doğru süzüləcək və nəticədə yeraltı sulara çatacaq. Əks halda, torpağın zərrəcikləri ilə sıx birləşmiş həll olunmayan kimyəvi maddələr torpağın üst qatında toplanaraq səth suları vasitəsilə gölləri, dərələri və çayları pestisidlərlə çirkləndirilməsi ehtimalı yüksəkdir. Yuylmaya ən çox əlverişli olan pestisidlər səthi 0,25-0,85 sm aralığında olan torpaqlardır (Aydinalp, Porca, 2004). Su

TƏBİƏT VƏ ELM Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.101. 2023 / Cild: 5 Sayı: 12 / 87-92 ISSN: 2707-1146
NATURE AND SCIENCE International scientific journal. Impact Factor: 2.101. 2023 / Volume: 5 Issue: 12 / 87-92 e-ISSN: 2709-4189

hövzələrinin pestisidlərlə çirklənməsinə həmçinin atmosferdəki uçucu pestisidlərində təsiri var, onların yağış zamanı yenidən çökməsi və sonra səth su obyektlərinə və torpağa daxil olması qaçınılmazdır. Ancaq bu yol nisbətən əhəmiyyətsizdir. Ümumiyyətlə, pestisidlər hidroloji sistemə əsasən səth eroziyası və torpaq qatları vasitəsilə yuyulma yolu ilə daxil olur, bununla da suda pestisidlərlə çirklənmə dərəcəsi pestisidin xüsusiyyətlərindən, torpağın xüsusiyyətlərindən, ərazinin şərtlərindən, həmçinin pestisidlərin tətbiqi və idarə edilməsi praktikasından asılıdır (National Research Council, 1993). Yeraltı suların pestisidlərlə çirklənməsi bütün dünyada problemdir. ABŞ Geoloji Xidmətinin (USGS) məlumatına görə, yeraltı sularda ən azı 143 müxtəlif pestisid və 21 transformasiya məhsulu, o cümlədən hər bir əsas kimyəvi sinifdən olan pestisidlər aşkar edilmişdir. Son iki onillikdə 43-dən çox ştatın yeraltı sularında pestisidlərə rast gəlinmişdir (Waskom, 1994). Hindistanda aparılan bir araşdırma zamanı Bhopal ətrafındakı müxtəlif əl nasoslarından və quyulardan götürülmüş içməli su nümunələrinin 58%-i EPA standartlarından yüksək olan üzvi-xlor pestisidləri ilə çirklənməsi aşkar olunmuşdur (Kole, Bagchi. 1995). Qrunt suları zəhərli kimyəvi maddələrlə çirkləndikdən sonra çirklənmənin dağılması və ya təmizlənməsi uzun illər çəkə bilər. Təmizləmə isə çox xərc tələb edən və mürəkkəb ola bilər, hətta bəzi hallarda isə qeyri-mümkün ola bilər (Waskom, 1994, O'Neil, Raucher, 1998; US EPA, 2001).

***Pestisidlərin parçalanması.*** Pestisidlərin əksəriyyəti üzvi birləşmələr olduğundan, onlar adətən mikrobial, fotokimyəvi və ya kimyəvi reaksiyalar nəticəsində deqradasiyaya məruz qalırlar. Mikrobial deqradasiya pestisidin karbon dioksidə parçalandığı minerallaşma prosesi və mikrobial reaksiyanın pestisidi digər kimyəvi formalara çevirdiyi ko-metabolizasiya aiddir. Pestisidlərin fotokimyəvi deqradasiyasına fotoliz deyilir ki, bu prosesdə pestisidlər ultrabənövşəyi (UV) işığın iştirakı ilə parçalanır. Pestisidlərin kimyəvi parçalanması redoks reaksiyası və torpaq məsamələrində mövcud olan hava, su və digər birləşmələrlə hidrolizi yolu ilə baş verir. Aşağı biodeqradasiya dərəcəsi olan pestisidlər uzun yarı ömürə malikdir və su mənbələrini potensial olaraq çirkləndirməyə meyllidirlər. Bundan əlavə, pestisidlərin deqradasiya prosesləri nəticəsində əsas pestisiddən daha aşağı və ya daha yüksək toksikliyə malik olan metabolitlər, qeyri-üzvi son məhsul və transformasiya məhsulları əmələ gəlir. Bundan əlavə, pestisidin hərəkətliliyi – pestisidin adsorbsiya qabiliyyəti və həllolma qabiliyyəti ilə idarə olunur. Torpaqda güclü şəkildə adsorbsiya olunan pestisidlərin torpaq profilindən aşağıya doğru sızma ehtimalı azdır, lakin səth axını vasitəsilə eroziyaya məruz qalmış torpaq hissəcikləri tərəfindən asanlıqla daşına bilir və nəticədə səth sularına (National Research Council, 1993).




**Şəkil 1. Pestisidlərin su mühitində transformasiyası**

Torpaq hissəciklərində zəif adsorbsiya olunan pestisidlər aşağı deqradasiya dərəcəsinə malik olan pestisidlər, 30 mq/L-dən çox yüksək həll olunma qabiliyyəti olan pestisidlər isə potensial yuyulan və ya həll olunan pestisidlər hesab olunur. İstifadə olunan pestisidlər arasında herbisid kimi istifadə olunan atrazin yüksək davamlılığına görə yeraltı sulara yüksək potensiallı təhlükəli birləşmə kimi tanınır. Siyanazin qısa yarı ömürə malikdir, buna görə də aşağı yuyulma potensialı var. Metil paration, torpaq hissəciklərinə yüksək adsorbsiya qabiliyyətinə və aşağı davamlılığa görə digər aşağı yuyulma potensiallı pestisiddir. 2,4-D bioloji təsirlə sürətlə parçalana bilən suda həll olunan pestisiddir və buna görə də torpaqda toplanma ehtimalı azdır və daha az davamlılığa malikdir (Lushchak, Matviishyn, Husak, Storey, Storey, 2018).

## Nəticə

Kənd təsərrüfatında istifadə olunan kimyəvi mühafizə vasitələrinin istifadəsində selektivliyin tətbiq olunması həmin maddələrin torpağa, suya və ətraf mühitə düşdükdən sonra toksiki birləşmələrə çevrilməsinin qarşısını ala bilər. Eyni zamanda zərərvericilərə qarşı kimyəvi mühafizə vasitələrindən başqa digər mübarizə üsullarının da (aqrotexniki, mexaniki, bioloji) tətbiqi su mühitinin və ətraf mühitin toksiki birləşmələr ilə deqradasiyasının qarşını almağa kömək edə bilər.

İstifadə olunan pestisidlərin xlor-üzvi tərkibli olması onların ətraf mühitdə daha gec parçalanmasına və hətta parçalandıqdan sonra alınan məhsulların su mühitinə və canlılarına təsirinin nə dərəcədə böyük olduğunu su mühitində gedən proseslər nəticəsində biz müşahidə edə bilirik. Bu cür təsirlərin qarşısının alnması üçün kimyəvi mühafizə vasitələrini seçərkən əsasən xlor-üzvi tərkibli olmamasına, suda və ətraf mühitdə tez parçalanmasına və parçalandıqdan sonra alınan məhsulların da suya, torpağa və ətraf mühitə təsirinin olmadığını bilmək vacibdir.

Su mühitində gedən kimyəvi proseslər nəticəsində su mühitinin kimyəvi tərkibi və balansı pozulur. Su mühitinin canlılar üçün əlverişli balansını saxlamaq üçün kənd təsərrüfatında istifadə olunan pestisidlərin (əsasəndə herbisidlərin) drenaj və kollektorlara qarışmasının qarşını almalı və su mühiti canlıları üçün təhlükə törədən kimyəvi tərkibli preparatlardan istifadənin minimuma endirməli və ya tamamilə istifadə edilməməlidir.

## Ədəbiyyat

1. Trautmann, N.M., Porter, K.S., Wagenet, R.H. (1985). Pesticides: Health Effects in Drinking Water.
2. Babayev, F.Ə.(1992). Bitkilərin kimyəvi mühafizəsi. Bakı, s.48-51.
3. Kole, R.K., Banerjee H, Bhattacharyya A. Monitoring of market fish samples for Endosulfan and Hexachlorocyclohexane residues in and around Calcutta. Bull Envirron Contam Toxicol. 2001;67, pp.554-559.
4. Bortleson G, Davis D. (1987–1995). U.S. Geological Survey & Washington State Department of Ecology. Pesticides in selected small streams in the Puget Sound Basin, pp.1-4.
5. US Department of the Interior. (1995). Pesticides in ground water: current understanding of distribution and major influences. U.S. Geological Survey. National Water Quality Assessment. Factsheet number FS, pp.244-95.
6. U.S. Geological Survey. (1998). National Water-Quality Assessment. Pesticide National Synthesis Project. Pesti-cides in surface and ground water of the United States. Summary of results of the National Water Quality Assessment Program.
7. U.S. Geological Survey. (1999).Circular 1225. Reston, VA: USGS; The quality of our nation's waters – nutrients and pesticides.
8. Aydinalp, C., Porca, M.M. (2004). The effects of pesticides in water resources. J. Cent. Eur. Agric. Vol.5, pp.5-12.
9. National Research Council; Board on Agriculture; Committee on Long-Range Soil and Water Conservation Policy. (1993). Soil and Water Quality: An Agenda for Agriculture; National Academies Press: Cambridge, MA, USA, ISBN 9780309049337.

10. Waskom, R.(1994). Best management practices for private well protection. Colorado State Univ. Cooperative Extension (August).
11. Kole, R.K., Bagchi, M.M.(1995). Pesticide residues in the aquatic environment and their possible ecological hazards. J Inland Fish Soc India. Vol. 27(2), pp.79-89.
12. O'Neil, W., Raucher, R.. Wayzata, M.N. (1998). Groundwater Policy Education Project; Aug, Groundwater public policyleaflet series No 4: The costs of groundwater contamination.
13. US EPA. Source water protection practices bulletin: Managing small-scale application of pesticides to prevent contamination of drinking water. 2001 Washington, DC: Office of Water (July). EPA 816-F-01-031.
14. Lushchak, V.I., Matviishyn, T.M., Husak, V.V., Storey, J.M., Storey, K.B. Pesticide toxicity: A mechanistic approach. EXCLI J. 2018, 17, 1101.

Göndərilib: 24.10.2023 Qəbul edilib: 28.11.2023

## YER ELMLƏRİ VƏ COĞRAFİYA

## EARTH SCIENCES AND GEOGRAPHY

DOI: https://doi.org/10.36719/2707-1146/39/93-101

**Səbinə Kazımova**
AMEA Respubilka Seysmoloji Xidmət Mərkəzi
minerologiya üzrə fəlsəfə doktoru
sabina.k@mail.ru
**Gültəkin Musayeva**
AMEA Respubilka Seysmoloji Xidmət Mərkəzi
musayeva.gultekin@inbox.ru
**Güləsər Əsgərova**
AMEA Respubilka Seysmoloji Xidmət Mərkəzi
guleserb95@mail.ru

# MAQNİTUDASI M=7.8, M=7.6 OLAN 6 FEVRAL 2023-CÜ İLDƏ KAHRAMANMARAŞ ŞƏHƏRİNDƏ BAŞ VERMİŞ ZƏLZƏLƏLƏRİN GÜCLƏNDİRMƏ FAKTORUNUN HESABLANMASI

**Xülasə**

Məqalədə 6 Fevral 2023-cü ildə 9 saat fərq ilə Türkiyə ərazisində, Kahramanmaraş şəhərində baş vermiş zəlzələlər təhlil edilmişdir. Geoloji, tektonik, seysmogeoloji məlumatlar əsasında 57 telemetrik seysmik stansiyalardan ibarət müşahidə şəbəkəsinə əsasən Türkiyə zəlzələləri analiz edilmişdir. Makroseysimik məlumatlara əsasən zəlzələlər ölkənin 10 vilayətində və İsraildə, İraqda, Livanda, Gürcüstanda, Azərbaycanda və Ermənistanda da hiss olunub. Mənbələrin dərinliyə görə paylanmasının təhlili 3 ilə 30 km dərinlikdə yerləşən iki mənbə zonasını göstərdi. 6 fevral 2023-cü ildə baş verən zəlzələnin mənbəyi şimal-şərq-cənub-qərb istiqamətində yönəlmiş Şərqi Anadolu qırılmanın dinamikası ilə bağlıdır. Türkiyənin əsas tektonik strukturlarından biri olan Şərqi Anadolu qırılması şimalda Karliova Üçlü Qovşağı ilə başlayır və cənubda Ölü dəniz qırağı ilə birləşir. Zəlzələlərin nəticəsində 50000 çox nəfər ölüb, 548777 yaralananlar, dağıntıya məruz qalmış bina sayı 198,000 çatmışdır. Ərazinin gücləndirmə faktorunu müəyyən etmək məqasədi ilə AFAD-ın rəsmi saytından 55 stansiya məlumatları götürülmüş, DİMAS proqramı vasitəsi ilə 3 kanalla emal olunmuşdur. Nakamura üsuldan isdifadə edilmişdir. Həmin ərazi üzrə gücləndirmə faktoru hesablanmışdır. Arcgis10.6 və Surfer10 proqramları ilə xəritələr qurumuşdur. Müəyyən edilmişdir ki, saat 04:17:35-də baş verən zəlzələdə gücləndirmə faktoru min 1.8-max 7.8; saat 13:29:49-də baş verən zəlzələdə isə gücləndirmə faktoru min 1.5-max 9.0 olmuşdur.

***Açar sözlər:*** *zəlzələ, telemetrik stansiyalar, AFAD, Dimas, Nakamura üsulu, gücləndirmə faktoru*

**Sabina Kazimova**
Repubilcan Seismic Survey Center of ANAS
PhD in mineralogy
sabina.k@mail.ru
**Gultakin Musayeva**
Repubilcan Seismic Survey Center of ANAS
musayeva.gultekin@inbox.ru
**Gulasar Asgarova**
Repubilcan Seismic Survey Center of ANAS
guleserb95@mail.ru

# Calculation of the amplification factor of the earthquake with the magnitude M=7.8, M=7.6 that happened in the city of Kahramanmarash on february 6, 2023

## Abstract

In the article, the earthquakes that occurred in the city of Kahramanmarash on the territory of Turkey on February 6, 2023, with a difference of 9 hours, were analyzed. Based on geological, tectonic, seismogological data, earthquakes in Turkey were analyzed based on the observation network consisting of 57 telemetric seismic stations. According to macroseismic data, earthquakes were felt in 10 regions of the country and in Israel, Iraq, Lebanon, Georgia, Azerbaijan and Armenia. Analysis of source distribution by depth indicated two source zones located between 3 and 30 km depth. The source of the earthquake that occurred on February 6, 2023 is related to the dynamics of the Eastern Anatolian fault, oriented in the northeast-southwest direction. One of Turkey's major tectonic structures, the Eastern Anatolian Fault begins with the Karliova Triple Junction in the north and joins the Dead Sea Fault in the south. As a result of the earthquakes, more than 50,000 people died, 548,777 were injured, and the number of destroyed buildings reached 198,000. In order to determine the strengthening factor of the area, the data of 55 stations were taken from the official website of disaster and emergency (AFAD) and processed with 3 channels using the DIMAS program. Nakamura's method was used. Amplification factor was calculated for that area. Maps were drawn with Arcgis10.6 and Surfer10 programs. It was determined that the amplification factor in the earthquake that occurred at 04:17:35 min 1.8-max 7.8; and in the earthquake that occurred at 13:29:49, the amplification factor was min 1.5-max 9.0.

***Keywords:*** *earthquake, telemetric stations, disaster and emergency (AFAD), Dimas, Nakamura, amplification factor*

## Giriş

2023-cü il fevralın 6-da səhər tezdən yerli vaxtla saat 04:17:36-da Türkiyənin cənub-şərqində Kahramanmaraş şəhərində maqnitudası M=7,8 gücündə güclü, dağıdıcı zəlzələ baş verib. 10 dəqiqə sonra saat 04:28:19-da onun ardınca 6,7 maqnitudalı zəlzələ və çoxsaylı afterşoklar baş verib. Və 9 saat sonra maqnitudası M=7,6 olan daha bir güclü zəlzələ baş verdi. Bu günə qədər 10000-dən çox afterşok baş verib, onlardan 8-ü 6,5-dən böyük. Zəlzələlərin nəticəsində 50000 çox nəfər ölüb, 548777 yaralananlar, dağıntıya məruz qalmış bina sayı 198,000 çatmışdır. Bu zərər miqdarı 30 saniyə davam edən vibrasiyaların müddəti ilə bağlıdır. Zəlzələnin seysmik aktivliyi ölkənin 10 vilayətində və digər ölkələrdə - İsrail, İraq, Livan, Gürcüstan, Azərbaycan və Ermənistanda da hiss olunub. Ocaqların dərinliyə görə paylanmasının təhlili 3 ilə 30 km dərinlikdə yerləşən iki mənbə zonasını göstərdi. Zəlzələ RSXM-nin 57 rəqamsal seysmik stansiyalarda qeydə olunub və analiz aparılmışdır (şək. 1).




**Şəkil. 1. 06.02.2023 yerli vaxtla saat 04:17, maqnitudası M=7,8 olan Türkiyədə, Kahramanmaraş şəhərində baş vermiş zəlzələnin seysmoqramı**

2023-cü ildə Türkiyədə baş verən güclü zəlzələlərdən sonra Türkiyənin əsas limanı - İsgəndərun ərazisində dəniz su basıb. Suyun səviyyəsinin qalxması ilə əlaqədar bulvar, küçə və prospektlər su altında qalıb, banklar və digər idarələr boşaldılıb. Zəlzələdən 2 gün sonra da su ərazidən çəkilməyib.

Qeyd etmək lazımdır ki 2022-ci ilin martında Ankaradakı Yaxın Şərq Texniki Universitetinin alimləri Qaziantep bölgəsinin mərkəzinin 6,5 bal gücündə zəlzələdən ciddi ziyan çəkə biləcəyinə dair araşdırma dərc etdilər. Bunun səbəbi Türkiyənin cənubundakı binaların əksəriyyətinin zəlzələlərə qarşı son dərəcə həssas olmasıdır. Bunlar kövrək kərpic hörmələri və bir-birinə yaxın tikilmiş aşağı mərtəbəli beton çərçivələri olan binalardır (Naddaf, 2023: 398).

Baş verən fəlakətli zəlzələdən sonra yaranmış 50 metr dərinlikdə, eni 200 m yaxın sürüşmə ərazisi aşağıdakı şəkildə gösdərilmişdir. Türkiyənin Hatay vilayətində zeytun bağı iki yerə ayrılmışdır, ağaclar yerini dəyişmişdir (şək.2).

TƏBİƏT VƏ ELM Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.101. 2023 / Cild: 5 Sayı: 12 / 93-101 ISSN: 2707-1146
NATURE AND SCIENCE International scientific journal. Impact Factor: 2.101. 2023 / Volume: 5 Issue: 12 / 93-101 e-ISSN: 2709-4189



**Şəkil 2. Hatay Təpəxan kəndindəki Zeytun bağı**

Zəlzələlər dünyanın ən dəhşətli təbii hadisələrindən biridir. Bu təbii hadisə minlərlə insan təlafatına, iqtisadi itkilərə səbəb olur. Türkiyə dünyanın ən seysmo aktiv zonalarından birində yerləşir. Türkiyə ərazisi Ərəbistan, İran və Anadolu plitəsinin təmas zonasında yerləşir (Aktuğ, Parmaksız, Kurt, Lenk, 2012: 78, Straub, 1992: 2513). Bu 3 plitənini hərəkəti nəticəsində plitələr ildə 10-20 mm şimal-şərq və şimal-qərb istiqamətində yerini dəyişir (McClusky, 2000: 5695). Burada iki ildən bir güclü zəlzələlər baş verir. Şərqi Anadolu qırılması sol tərəfli yerdəyişmə hərəkəti ilə xarakterizə olunur və müxtəlif seqmentlərdən ibarətdir (Özener, 2016: 1). Seqmentlərin uzunluğu nəzərə alındıqda, hər bir seqmentin 7.0 və ya daha böyük bal gücündə zəlzələ törətmək potensialı var. İnstrumental dövrün zəlzələləri dağıdıcı zəlzələlər baxımından Şərqi Anadolu qırağının orta və şimal-şərq hissəsinin yüksək aktivliyini göstərir. 20-ci əsrdə Türkiyədə ən güclü zəlzələ Ərzincan vilayətində baş vermişdir. Bu hadisə, 1939-cu il dekabrın 26-da baş verdi. Zəlzələnin gücü Rixter cədvəli üzrə 7,9, hiposentirin dərinliyi isə 20 km olub. Bu zəlzələ 32.968 nəfərin ölümünə, 100.000-dən çox insanın yaralanmasına və 200.000-dən çox evin dağılmasına səbəb olub (7). Evsiz qalan insanlar donaraq öldü. Daha sonra, 13 mart 1992-ci ildə həmin ocağda yenidən maqnitudası M=6,8 olan gücündə daha bir güclü zəlzələ baş verdi, təxminən 500 nəfər öldü və 8000-dən çox bina dağıldı. Bir tektonik qırılma üzərində yerləşərək, 17 avqust 1999-cu ildə Kocaeli vilayətində maqnitudası M=7,6 olan dağıdıcı zəlzələ qeydə alınıb. Zəlzələnin müddəti 37 saniyə olub, bu da 17 mindən çox insanın ölümünə səbəb olub (şək.3).




**Şəkil 3. 1939-2023-cü illər ərzində Türkiyədə baş vermiş dağıdıcı zəlzələlər**

Ərzurum şəhərində 30 oktyabr 1983-cü ildə baş verən zəlzələ 1155 nəfərin həyatına son qoydu. 1999-cu il 12 noyabrda Ml=7,2 Düzcə zəlzələsi, 24 yanvar 2020-ci ildə 6,7 gücündə Elazığ dağıdıcı zəlzələsi baş vermişdir. 2011-ci il oktyabrın 23-də Van şəhəri yaxınlığında 7,1 bal gücündə

zəlzələ baş verib (3). Onun qurbanları 604 nəfər olub, 600 mindən çox insan evsiz qalıb. 30 oktyabr 2020-ci ildə Egey dənizində Rixter cədvəli üzrə M=7,0 olan zəlzələ baş verib. Zəlzələ Afina və İstanbulda hiss olunub. Ən çox zərar İzmir çəhərində qeydə alınıb, burada 20-yə yaxın ev uçub. Türkiyədə bu zəlzələ nəticəsində ümumilikdə 119 nəfər həlak olub, 1053 nəfər yaralanıb.

**Ərazinin seysmikliyi.** Ocaq zonasında gərginliyin boşalması iz buraxmadan keçmir. Gərginliklər Yer qabığının süxurları boyunca yenidən paylanır və çox vaxt xeyli məsafədə yaranır və çoxsaylı afterşokların mənbəyinə çevrilir. Hazırda Türkiyədə baş verən zəlzələ nəticəsində qırılmalar boyunca yığılan gərginlik böyük bir əraziyə yayıldı. İlkin hesablamalardan belə çıxır ki, "aktiv rayon"-nun uzunluğu 190 kilometr, eni isə 25 kilometr uzanıb (14). Yerdəyişmənin giyməti isə 3 km bərabərdir (Toda, 2023, 14). Qrafikdən göründüyü kimi, ay ərzində hər gün orta hesabla 450 afterşok müşahidə olunub (şək. 4, 5). Bu zəlzələ nəticəsində 613*10^13 Joul seysmik enerji ayrılmışdır. Zəlzələlərin maqnitudası əsasən 1,0-4,0 arasında dəyişib.




**Şəkil 4. Türkiyədə baş vermiş zəlzələlərin afterşoklarının günlər üzrə paylanması**

Hazırda bölgədə seysmik aktivlik səngiməyə başlayır. Lakin bəzi ekspertlərin fikrincə, bu zəlzələlərdən sonra təkrar təkanlar daha bir neçə il davam edə bilər (belə hallar elmə məlumdur). Bu, fokus zonasında stresin aradan qaldırılması və ətraf mühitin yenidən qurulması prosesləri ilə əlaqədardır.




**Şəkil.5. Şərqi Aralıq dənizi, Qafqaz və İran regionlarında 2022-2023-cü illərdə baş vermiş zəlzələlərin episentrlər xəritəsi (Yetirmishli, 2023: 35)**

**Gücləndirmə faktoru**. Binaların geniş miqyasda dağıdılmasına səbəb kimi bu sahə üçün risk səviyyəsinin lazımi səviyyədə qiymətləndirilməməsi, habelə yerli hakimiyyət orqanları tərəfindən binaların təhlükəsizliyinin müntəzəm yoxlanılmaması göstərilir. Zəlzələdən sonra bucür dağıntılara səbəb olması, birincisi zəlzələnin gücünə görə, Türkiyədə 1939-cu ildən bəri ən güclü zəlzələdir və bilavasitə əhalinin məskunlaşdığı ərazidə baş verdib. Böyük itkilərə səbəb olan digər kədərli amil zəlzələnin vaxtıdır. Zəlzələ səhər saat dörd radələrində baş verib. Evlər, təhlükəyə hazırlaşmağa vaxtı olmayan, yatan və ya yuxulu insanların üzərinə birbaşa çökdü. Qeyd etmək lazımdır ki insanlar tez-tez zəlzələlərdə kərpic və hörgünün yıxılması nəticəsində həlak olur.

1999-cu il 12 noyabrda ml=7,2 Düzcə zəlzələsi faciəsindən sonra Türkiyə hökuməti yeni tikinti qaydaları və zəlzələdən icbari sığorta sistemi tətbiq etdi. Bu gün Türkiyənin seysmik təhlükə xəritəsinə nəzər salsaq görərik ki, Anadolu qırılma zonaları PGA 0,5 qal qeydə olunur, bu da 10 bala intensivlikliyə bərabərdir. Lakin bu zəlzələdən zərər çəkmiş binaların çoxu 2000-ci ildən əvvəl tikilib.

Eyni zamanda Suriyada seysmik cəhətdən təhlükəsiz binalar daha da azdır ki, bu da Hələb və İdlibdə binaların dağılmasına səbəb olub.

İnşaatçılar yeni binanın tikintisinə başlamazdan əvvəl tikinti sahəsinin seysmik müqavimətini müəyyən etmək lazımdır. Tikinti sahələrinin seysmik təhlükəsini aydınlaşdırmaq üçün ərazinin konkret mühəndis-geoloji, geomorfoloji və hidrogeoloji şəraitindən asılı olaraq seysmik mikrorayonlaşdırma aparılır. Torpağın titrəyişlərinin intensivliyinin dəyişməsi onun elastik xüsusiyyətlərindən, bu da öz növbəsində sıxlıq, rütubət və konsistensiya kimi torpağın xüsusiyyətlərindən asılıdır.

Hazırda seysmik təsirlər altında qruntun reaksiyasının modelləşdirilməsi mühəndis seysmologiyasının ən mühüm və eyni zamanda problemli məsələlərindən biridir. Dağıdıcı LomaPrieta nümunələri (1989); Northridge (1994); Kobe (1995); Nefteqorsk (1995); Tayvan (1999); Son onilliklərin Gujarat (2001), Elazığ (2020)) müxtəlif yer şəraitində bina və tikililərə dəyən zərərin əhəmiyyətli dərəcədə dəyişdiyini göstərir. Güclü və zahirən "zəlzələyə davamlı" tikililər tez-tez dağılır, az mərtəbəli binalar isə zədələnmədən qalır (Bindi, 2000: 97). Boş çöküntülər üzərində yerləşən binalar zəlzələ spektrində müəyyən vibrasiya tezliklərini gücləndirir. Eyni zamanda, vulkanik (metamorfik) süxurlarda yerləşən binalarda bir neçə kilometr məsafədə zəlzələ daha az hiss olunur və dağıntılara səbəb olmur. Müəyyən edilmişdir ki, qayalı qruntlarda hərəkət spektrinin kritik tezlikləri ağır zədələnmə zonasında torpaqlarda ölçülənlərin cəmi 10%-ni təşkil edir.

Bu səbəblərə görə türkiyədə baş vermiş zəlzələlərin ocaq zonalarında gücləndirmə faktorunu hesablanmışdır. AFAD-ın rəsmi saytından 55 stansiya məlumatları götürülmüş, DİMAS proqramı vasitəsi 3 kanalla emal olunmuşdur. DİMAS proqramında Nakamura üsulundan isdifadə olunub.

80-ci illərdə Nakamura tərəfindən təklif edilən "Nakamura" metodu hesab edirdi ki, MHVR bizə üfüqi komponentdə zəlzələnin S dalğasının gücləndirilməsi faktorunu birbaşa təmin edir (Nakamura, 1989,:25). Nakamura metodu və ya ətraf mühitin səs-küyünə tətbiq olunan spektral nisbət metodu, üç ortoqonal komponentdə yayılan seysmik dalğaların ölçülməsi yolu ilə ətraf mühitin səs-küyünü qeyd edən qeyri-invaziv passiv üsuldur. Bu texnika üçoxlu geofonla əldə edilən ekoloji vibrasiya qeydlərinin üfüqi və şaquli komponentlərinin Furye spektrlərinin müəyyən edilməsindən ibarətdir. Bunlardan zirzəmidə torpaq laylarının təxmini transfer funksiyası kimi qəbul edilən H/V nisbəti (spektral əmsal) alınır ( Parolai, 2004: 1096). Zəlzələ məlumatlarının təhlili kimi, analiz üçün üç komponentdən istifadə olunur, onların üfüqi komponentləri RMS dəyərini hesablamaq üçün tətbiq edilir. Sonra MHVR RMS/UD nisbəti kimi hesablanır. Nəhayət, hər bir seqment üçün hesablanmış MHVR-lər on beş seqment üzrə orta hesablanır (şək.6).

H/V spektral nisbətini əldə etmək üçün müvafiq sahə ölçmələrini aparmaq lazımdır. Ölçmələrin sayı tədqiq ediləcək ərazidən asılıdır və minimum 20 ilə 30 dəqiqə davam edən minimum 3 ölçmə aparmaq tövsiyə olunur (Picozzi, 2008: 2).



**Şəkil 6. Dimas proqramı vasitəsilə 3 komponentə əsasən dalğa yazısının maxsimum amplitudasının qrafiki**

Həmin ərazi üzrə gücləndirmə faktoru hesablanmışdır. Arcgis10.6 və Surfer10 proqramları ilə xəritələr qurumuşdur. Mavi rəngdə olan rəqəmlər daha az zədələnməyə uyğun gələn daha aşağı gücləndirmə əmsalı olan sahələri göstərir. Gücləndirmə əmsalının maksimum dəyəri olan zonalar qırmızı rənglə qeyd olunur ki, bu da binaların çoxsaylı dağılması ilə xarakterizə olunan bölgələrə uyğundur. Tədqiqatlar göstərmişdir ki, yaxınlıqda yerləşən və eyni tikinti materialından tikilmiş binalar fərqli dayanıqlılıqla xarakterizə olunur. Çünki bu binaların altında geoloji quruluş və stratiqrafik strukturlar fərqli ola bilər. Eyni zəlzələdən yaranan seysmik dalğalar seysmik dalğanın gücləndirmə əmsalına görə bir bina üçün 3-4 bal, digər bina üçün 6-7 bal ola bilər. Xəritədən göründüyü kimi 04:17:35-də baş verən zəlzələdə gücləndirmə faktoru Min 1.8-Max 7.8, saat 13:29:49-də baş verən zəlzələdə isə gücləndirmə faktoru Min 1.5-Max 9.0-dır (şək. 7, 8).




**Şəkil 7. 04:17:35-də baş verən zəlzələnin gücləndirmə faktoru**




**Şəkil 8. 13:29:49-də baş verən zəlzələnin gücləndirmə faktoru**

Şəkildən göründüyü kimi, birinci zəlzələdən sonra gücləndirmə əmsalının paylanması vahid deyil. Hatay şəhərinin şimal hissəsində gücləndirmə əmsalı 1,8-3,4, eyni şəhərin cənub-şərq hissəsində isə 4,5-5,5 arasında dəyişir. Eyni mənzərə Qaziantep şəhəri üçün də müşahidə olunur. Şəhərin şimal hissəsi aşağı qiymətlərlə, cənub hissəsi isə yüksək dəyərlərlə səciyyələnir. Ən yüksək dəyər Kahramanmaraş şəhərində qeyd edildi.

İkinci zəlzələdən sonra nəticəni araşdırdıqda məlum olur ki, maksimum dəyərlər Qaziantep şəhərində qeydə alınıb və bu bölgədə çoxsaylı dağıntılara səbəb olub.

**Nəticə**

Bu zəlzələ son 100 ilin ən dəhşətli zəlzələsidir. M≥7.8-7.6 gücündə olmuşdur. Bu gücdə baş verən zəlzələ 32 atom bombasının partlamasına bərabərdir. Ancaq bu qədər itkilərin olmasını səbəbi insan əli ilə yaradılmış binalar, yollar, körpülər, infrastruktutlardır. Həmin Türkiyə zəlzələsində 50.000-dən çox, Suriyada 8476 insan həyatının itirmiş, 548777 insan yaralanmış, 198000 bina tamamilə yararsız hala düşmüşdür. Eyni ərazidə bir binanın tamamiilə dağılması, digərində az xəsarətin olmasının səbəbi H/V torpaq dərinliyi, inşaat şirkəti, mühəndislik, binalarda mərtəbələrin fərqli olmasıdır.

Beləliklə, belə nəticəyə gəlmək olar ki, gücləndirmə faktorunu müəyyən etmək üçün əldə etdiyimiz məlumatlar əsasında (AFAD-ın saytında 55 stansiya məlumatları götürülmüş, DİMAS proqramı vasitəsi 3 kanalla emal olunmuş, DİMAS proqramında Nakamura metodundan isdifadə edərək) tərtib etdiyimiz xəritədə zəlzələnin bas verdiyi ərazidə gücləndirmə faktorunun əmsalı verilmiş şkalada yüksek qiymətlə, yaxın ərazilərdə aşağı qiymətlə hesablanır. Bu iki zəlzələdə gücləndirmə faktoru 1-ci zəlzələ ücün Min 1.8-Max 7.8, 2-ci zəlzələ üçün Min 1.5-Max 9.0 hesablanmşdır. Hatay şəhərinin şimal hissəsində gücləndirmə əmsalı 1,8-3,4, eyni şəhərin cənub-şərq hissəsində isə 4,5-5,5 arasında dəyişir. Eyni mənzərə Qaziantep şəhəri üçün də müşahidə olunur. Şəhərin şimal hissəsi aşağı qiymətlərlə, cənub hissəsi isə yüksək dəyərlərlə səciyyələnir. Ən yüksək dəyər Kahramanmaraş şəhərində qeyd edildi.

İkinci zəlzələdən sonra nəticəni araşdırdıqda məlum olur ki, maksimum dəyərlər Qaziantep şəhərində qeydə alınıb və bu bölgədə çoxsaylı dağıntılara səbəb olub. Məhz bu təhlillərdən sonra dizaynerlər və mühəndislər bu ərazidə neçə mərtəbə tikilə biləcəyinə qərar verməlidirlər. Lakin bu gün tərtibatçılar tikilməkdə olan binaların yerləşdiyi yerin seysmoloji qiymətləndirilməsi üçün müraciət etməyi dayandırıblar.

Beləliklə, belə qənaətə gəlmək olar ki, evlər ərazinin seysmik müqaviməti nəzərə alınmadan tikilir. Və bu gün Türkiyədə baş verən hadisələr seysmik aktivlik zonasında olan bütün ölkələr üçün bu məsələni bir daha gündəmə gətirib.

## Ədəbiyyat

1. Naddaf, M. (2023). Turkey-Syria earthquake: what scientists know. Nature 614, pp.398-399.
2. Aktuğ, B., Parmaksız, E., Kurt, M., Lenk, O., Kılıçoğlu, A., Gürdal, M.A, Özdemir, S. (2013). Deformation of Central Anatolia: GPS implications. J Geodyn 67, pp.78-96. doi:10.1016/j.jog.2012.05.008
3. Straub, C., Kahle, H.G. (1995). Active crustal deformation in the Marmara Sea Region, N.W Anatolia, inferred from GPS measurements. Geophys. Res. Lett. 26, pp.2513-2516. Saroglu, F., Emre, O., Kus ¨C.U.I., 1992- Turkish Active Faults Map. Directoriate of Mineral Research and Exploration, Ankara, Turkey.
4. McClusky, S., Balasdsanian, S., Barka, A., Demir, C., Georgiev, I., Hamburger, M., Hurst, K., Kastens, K., Kekelidze, G. (2000). Global positioning system constraints on crustal movements and deformations in the eastern Mediterranean and Caucasus. J. Geophys. Res. 105, pp.5695-5719.
5. Özener, H., Aktuğ B., Doğru A., Sabuncu A., Turgut, B., Halıcıoğlu, K., Yılmaz, O. (2016). Slip rates and seismic potential on the East Anatolian Fault System using an improved GPS velocity field. Journal of Geodynamics.
6. Orta Doğu Teknik Üniversitesi. (2023). 6 Şubat, Kahramanmaraş-Pazarcık Mw=7.7 ve Elbistan Mw=7.6 Depremleri Ön Değerlendirme Raporu. https://eerc.metu.edu.tr/tr/system/files/documents/DMAM_2023_Kahramanmaras-Pazarcik_ve_Elbistan_Depremleri_Raporu_TR_final.pdf
7. https://zemletryaseniya.ru/sejsmicheskie-zony-evropy-i-sejsmichnost-evropejskogo-regiona/
8. US Geological Survey. (2023). Event page of the M7.8 and M7.5 Kahramanmarash Earthquake Sequence. https://usgs.gov/programs/earthquake-hazards/earthquakes.
9. Toda, S. (2023). Stress change calculations provide clues to aftershocks in 2023 Turkey earthquakes. Temblor. https://doi.org/10.32858/temblor.295.9
10. Yetirmishli, G.J., Nabelek, L.J., Kazimova, S.E., Kazimov, I.E.(2023). Source mechanism of Turkish earthquakes occured on 06.02.2023 with M=7.8, 7.6, Seismoprognosis observations in the territory of Azerbaijan, Vol. 23. №1, pp.33-37.
11. Bindi, D., Parolai, S., Spallarossa, D., Catteneo, M. (2000). Site effects by H/V ratio: Comparison of two different procedures. Journ. of Earthquake Engin. Vol. 4. № 1, pp.97-113. 3.
12. Nakamura, Y. (1989). A method for dynamic characteristics estimation of subsurface using microtremor on the ground surface. Y.Nakamura. QR Railw. Tech. Res. Inst. 30. pp.25-33.
13. Parolai, S. (2004). Comparison of Different Site Response Estimation Techniques Using aftershocks of the 1999 Izmit Earthquake. D.Bindi, M.Baumbach, H.Grosser, C.Milkereit, S. Karakisa, S. Zunbul. Bulletin of the Seismological Society of Amer. June, Vol. 94. № 3. pp.1096-1108, 2.
14. Picozzi, M. (2008). Site characterization by seismic noise in Istanbul, Turkey. A.Strollo, P.Parolai, E.Durukal, O.Ozel, S.Karabulut, J.Zschau, M.Erdik. Soil Dynamics and Earthquake Engineering. 2008. pp.2-6. 4.

Göndərilib: 27.09.2023 Qəbul edilib: 03.12.2023

## İÇİNDƏKİLƏR

### TİBB VƏ ƏCZAÇILIQ ELMLƏRİ

### MEDICAL AND PHARMACEUTICAL SCIENCES



### KİMYA

### CHEMISTRY



### FİZİKA VƏ ASTRONOMİYA

### PHYSICS AND ASTRONOMY



### BİOLOGİYA ELMLƏRİ VƏ AQRAR ELMLƏR

### BIOLOGICAL SCIENCES AND AGRARIAN SCIENCES

## YER ELMLƏRİ VƏ COĞRAFİYA

## EARTH SCIENCES AND GEOGRAPHY

